**Bu kitab Minayə İmanverdiyevanın**
**50 illik yubileyi ilə əlaqədar**
**qızı Aygündən ona hədiyyədir.**

***İmanverdiyeva (Mirzəyeva) Minayə Talıb qızı 25 iyun 1967-ci ildə anadan olub. 1985-ci ildə Fəxrəddin İmanverdiyev ilə ailə həyatı qurub. Şirvan şəhərində yaşayır. Gülnar, Aygün, Şəhla adlı üç qızı, İsmayıl adlı bir oğlu var.***

## VƏTƏN

Yardı-yaraşıqdı vətən,
Ömrümə işıqdı vətən.
Neçə igid şəhidi var,
Onlara aşiqdi vətən.

Borcluyuq sənə, vətən,
Görüşsək yenə vətən.
Gələrik vallah onda,
İmana, dinə vətən.

Sən bizim canımızsan,
Damarda qanımızsan.
Ayrı düşəli səndən,
Açılmaz danımızsan.
***07.08.2003***

## PAYIZ

Payızda qəlbimə çən-çiskin çökər,
Payızda ağaclar yarpağın tökər.
Payızda hər şeydən, hər şeydən betər,
Ürəyim üşüyər qüssədən, qəmdən,
Payızda özümə gəzirəm həmdəm.

Quşlar uçub gedər, qaralar hava,
Boş qalar nə qədər ağacda yuva.
Necə dözsün bülbül, durna soyuğa,
Ürəyim üşüyər qüssədən, qəmdən,
Payızda özümə gəzirəm həmdəm.

Mən payız fəsliyəm, sevin məni də,
Gözəldir yağışı, duman, çəni də,
Ötüb keçmir nədən, keçmir yenidən,
Ürəyim üşüyər qüssədən, qəmdən,
Payızda özümə gəzirəm həmdəm.

Minayə dərd çəkmə, ötüşər payız,
Hamı deyib gülər, mən tənha, yalnız.
Qəlbindən sil qəmi deyilsən yalqız,
Ürəyim üşüyər qüssədən, qəmdən,
Payızda özümə gəzirəm həmdəm.

## VƏTƏNİ OLMAYAN YETİMDİR, YETİM

Həyatda təmiz ad əzizdir candan,
Bu yolda can verib neçə qəhrəman.
Yurddan perik düşən neçə min insan,
Vətəni olmayan yetimdir, yetim.

Dünyada məhəbbət, dostluq olmasa,
Bəlkə də dünyaya gəlməzdi insan.
Ayrılıq olmasa, hicran olmasa,
Vüsalın qədrini bilməzdi insan.

Minayə söyləsin, bunu eşit, bil,
Ən böyük yetimdir inamı ölən.
Anası, atası ölənlər deyil,
Vətəni olmayan yetimdir, yetim.
***30.03.2003***

## AY GÖZÜ DÜNYADAN DOYMAYAN İNSAN

Söyləyim sözümü sən bir an dayan,
Ay gözü dünyadan doymayan insan.
Dünya etibarsız, ömür əmanət,
Qarşıda durubdu əcələ möhnət,
Ay gözü dünyadan doymayan insan.

Tərk edib gedirik dünyanı heyhat,
Kimə vəfa verib vəfasız həyat.
Kim gedib dünyadan əlində dövlət,
Ay gözü dünyadan doymayan insan.

Kiminin dövləti övlada qaldı,
Kiminin sərvəti əğyara qaldı,
Bu dünyanın varı dünyada qaldı,
Ay gözü dünyadan doymayan insan.

Yoxsula, zəlilə əl tut dünyada,
Yetimi, acizi daim sal yada.
Yetiş dara düşənlərə imdada,
Ay gözü dünyadan doymayan insan.

Əzəldən vəfası olmayan dünya,
On iki imama qalmayan dünya,
Sənə qalmayacaq inan bu dünya,
Ay gözü dünyadan doymayan insan.

Minayə söyləyər sözün düzünü,
Haqqın dərgahına bərk tik gözünü.
Mənəm-mənəm deyib, öymə özünü,
Ay gözü dünyadan doymayan insan.

## ŞƏHİD QARDAŞIMA

Mərd bir nəslin övladıydın,
Vətən baş tacındı, qardaş.
Gözündən sənsiz yaş tökən,
Bu dərdli bacındı, qardaş.

Dil dodaqda gəzir adın,
Sevir səni dostun, yadın.
İyirmi üç il yaşadın,
Ad qoydun küçəndə, qardaş.

Bələd idin hər dağ, daşa,
Dayaq idin dost-yoldaşa,
Ölüm baxmır nədən yaşa?
Gənckən şəhid oldun, qardaş.

Yağı qıydı sən tək mərdə,
Anan dözmədi bu dərdə.
Hər ikiniz eyni ildə,
Köçdünüz torpağa, qardaş.

Deyilməmiş sözüm qaldı,
Yollar boyu gözüm qaldı,
Bizə səbr, dözüm qaldı,
Dözmürəm bu dağa, qardaş.
***07.01.1997***

## ŞƏHLA BALAM

Mənim sevimli, əziz,
Gözləri ceyran balam.
Baxışın canlar alır,
Bal balam, Şəhla balam.

Diqqət elə sözünə,
Sığal çək üz-gözünə.
Mən qurbanam özünə,
Bal balam, Şəhla balam.

Az danışar, çox gülər,
Tez küsər, tez inciyər.
Hərdən dodağın büzər,
Bal balam, Şəhla balam.

Mehriban ol anana,
Sənə candan yanana.
Qurban sən tək qanana,
Bal balam, Şəhla balam.

## AYGÜN

Müştaqı olmuşam qara gözünə,
İstəkli, sevimli qızımsan, Aygün.
Necə vurulmayım sənin sözünə,
Sən mənim sevimli qızımsan, Aygün.

Gündüzlər dünyaya saçırsan işıq,
Evimə bəzəksən, yurda yaraşıq.
Bu dünya bir üzük, biz ona qaşıq,
Sən mənim sevimli qızımsan, Aygün.

Gah sərin küləksən, gah coşqun dəniz,
Dilin şipşirindi, ürəyin təmiz.
Gözlərin qaradır, özün ağbəniz,
Sən mənim sevimli qızımsan, Aygün.

Sən gah müğənnisən, gah da ki, rəssam,
Səndəki ilhama inan vurğunam.
Mənim istedadlı, ağıllı balam,
Sən mənim sevimli qızımsan, Aygün.

# GÜLNAR QIZIM

Nə vüqarlısan nə qəmlisən,
Heyatda ümidini qırma qızım.
Gül kimi qədəmlərin qönçələnsin,
Neçə-neçə arzuna çatasan qızım.

Bulaqlar axır sərin-sərin,
Küləklər əsir sərin-sərin.
Anana həm bacı ol həm də qız,
Başın uca olsun həyatda Gülnar.

Adın güllərlə başlanır,
Turşməzə narla qurtarır.
Gül kimi həmişə gül açasan,
Nar kimi həyatda barlı olasan.

Qoy Allah həyatda sənə yar olsun,
124 min Peyğəmbər sənə kömək olsun.
Həyatın gül açsın solmasın heç vaxt,
Mənimdə qəlbimə yar olasan Gülnar.

# DƏNİZ

Yenə çırpınır bu dəniz,
Dalğalarla danışır bu dəniz,
Sahillərə baş vurub, qayıdır,
Asta-asta danışır bu dəniz.

Sahilləri gəzirəm tək,
Ümidlə baxıram sənə dəniz.
Dalğaların çırpınır dəniz,
Ürəyim səninlə danışır dəniz.

Sənsizəm bu dünyada ay dəniz,
Danış dərdlərini ay dəniz,
Hər dalğan bir söz deyir,
Ümidini qırma ay dəniz,
Danış, danış ay dəniz.

Qısqanıram səni sahillərinə,
Daşa, qayaya, torpağa.
Hər sözüm acı gəlir sənə,
Qoy dərdimi danışım dəniz.

Uzaq yollarım da acıdır, acı,
Gözlərim gülmür, qəmlidir, qəmli.
Sevirəm dənizi çırpınsa da belə,
Al məni qoynuna ay dəniz.

Səni mənim kimi sevən olmaz,
Gül-danış dalğalan dəniz.
Sahillərə baş çək dəniz,
Dalğalarınla danış dəniz.

## YOLLAR

Yollar insanı aparır xəyallara,
Uzun yol deyir bütün ürək sözlərin.
Həyat uzundur, yollar enişli-yoxuşlu,
Mənim uzun yolum qəm-dərddir ancaq.

Gülüb-danışmaq istərəm,
Həyatı xoş görmək istərəm,
Yolları təmiz səliqəli istərəm,
Ürəyimi dərdsiz istərəm yollar.

Həyatda bütün çətinliyi gördüm,
Ürəyə yol tapan insanı gördüm.
Məni qəmli edən yolları gördüm,
Ey həyat uzun yolları dərdsiz elə.

Gülüb-danışmaq uzun yolu qısa edər,
Dərdli insanı dərdsiz edər bu yollar.
Qoca ürəyini cavanlaşdırar bu yollar,
İnsanı xəyallara aparar bu uzun yollar.

## YUXU

Səni yuxuda gördüm sevgilim,
Qorxuram ayıram səni yuxudan.
Sənin obrazını görürəm inan,
Yuxuda bir yerdə gəzirəm inan.

Mən həsrət çəkirəm sənsiz,
Biz bir yerdəyik yuxuda.
Ayılmaq istəmərəm yuxudan,
Qorxuram bir daha görmərəm səni.

Mən ayıldım yuxudan,
Gəzirəm tək bu dünyada.
Gəlsin uzun gecələr,
Yuxuda görürəm səni sevgilim.

Yuxu illik qalmır inan,
Gecə keçir səhər gəlir.
Səni də gecə aparır,
Qalırsan keçən yuxuda.

Kaş ki, doğru olaydı,
Yuxuda gördüklərim.
Həyat şirin vüsaldı,
Kaş ki, yuxu olmayaydı.
***25.06.1984***

## HABİL AĞLAYIR

Bir gün həzin musiqi səsi,
Doldu qəlbimə acı göz yaşı.
Kamança ağlayırdı lap acı-acı,
Soldu qərənfillər şəhidlər məzarı üstə.

Sızlayırdı Habil kamança üstə,
Layla çalırdı şəhidlər üstə.
Ağlayırdı Habil kamança üstə,
Ana vətən, doğma elim Azərbaycan.

Nə dərd, nə qəm çəkdin ay elim,
Neçə igidin şəhid oldu bu elin.
Yaraşmır sənə qəmli göz yaşı,
Doğma elim, anam Azərbaycanım.

Habil ağlayır kamança ilə,
Dolu qəlbin boşaldır simlər ilə.
Bürünüb elim qırmızı qərənfilə,
Ağlayır qərənfillər kamança ilə.

Bir gün gəlsin sevinsin elim,
Habilin göz yaşı sevincdən olsun.
Alınsın düşmən əlindən doğma elimiz,
Habil çal, həzin musiqini şəhidlər üçün.

Qoy düşmən sevinməsin biz ağlayırıq,
Vətən fəxr edir igid oğulları ilə.
Çal Habil ağlasın kamança,
Ürəklərə sərinlik gətirsin kamança.
***07.04.1990***

## HANI ZEYNƏBİN SƏSİ

Göründü şəhidlər xiyabanında,
Qaraya bürünmüş bir el qızı.
Göz yaşı tökdü bu el qızı,
Şəhidlər deyə Zeynəbimin səsi.

Hanı o gözəl səhnə, hanı Zeynəbim,
Hanı şən səsli, Zeynəbin səsi hanı.
Güllü çiçəkli xoş sifətli,
Uca səslə qışqıran tamaşaçılar,
Oxu Zeynəb deyə qışqıranlar.

Ağladı Zeynəb bir an dilə gəldi,
Oxuya bilmirəm Vətən qan içindədir.
Ürəyim qaralı yaralı qan içindədir,
Oxumadı bir daha Zeynəbim belə.

Odlandı yandı o gen qəlbli el qızı,
Geyindi qara dərin yanıqlı el qızı.
Ağladı həmişə Şəhidlər deyə,
Bir daha şənlənmədi bu el qızı.
***23.04.1990***

## ÇİNGİZİN ÜRƏYİ

Uca boyuna qurban, ay Çingiz qardaş,
Halal zəhmətinə elin qurban ay qardaş.
Təmiz qəlbli ürəyi dolu ay qardaş,
Neçə-neçə ananın oğlusan ay qardaş.

Gözlə dedim özünü düşmən gülləsindən,
Qorumadın özünü oddan-alovdan.
Anaların haqqı tapdanmasın dedin,
Şəhid oldun sən də bu el yolunda.

Çingizin ürəyi dolu getdi,
Neçə-neçə deməyə sözü getdi.
Azərbaycan bilməyən sirləri getdi,
Hələ açılmayan sirləri getdi.

Yaşasaydın sən xalqı azad edərdin,
Düşmən gücünü məhv edərdin sən.
Gözlədin son məqamı sözlərin ilə,
Ürəyi dolu igidim Çingizim getdi.

Öz operatorluğun, sübutluğun,
Açdı neçə bağlı siri, sirdaşı.
Sən sirdaş idin Azərbaycana,
Yaşa qəlblərdə yaşa Çingizim.
***20.01.1998***

## QARABAĞIN QARA GÜNLƏRİ

Kim qoydu bu adı sənə,
Yaraşmayır bu ad sənə.
Kaş bu ad qoyulmayaydı sənə,
Qarabağım, qara baxtım.

Sən Qarabağ deyilsən,
O şən üzlü sınmaz qəlbli,
Ürəyi dolu başı qarlı,
Səfalı məskənim, Azərbaycanım.

Hanı mənim doğma elim,
Şuşam, Laçınım, Kəlbəcərim.
Xocalı, Xankəndim, Qubadlım,
Zəngilanım, Cəbrayılım, Füzulim,

Qırılmaz qollarım qırdılar bir an,
Saplağı özümüzədən qara cilidli,
Gizlin olan düşmənlərimiz.

Neçə igidin məhv oldu belə,
O odlu sinəndə torpağında.
Şən səsli güllü çiçəkli vətənim,
Od alov içindədir Qarabağım.

Hündür boylu enli sinəndə,
Qanına bələdi top tüfəngdə,
Göz yaşı içində ah-nalə içində,
Qaldı Qarabağ doğma vətənim.

Anaların ah-naləsi yayıldı,
Şəhidlərin məzarı üstə.
Başlandı sanki vəhşiliklər,
Qarabağın qara günləri.
***06.08.1994***

## YARALI QƏLBİM

Deyirlər ayrılıq asandır asan,
Torpağın üzü soyuqdur soyuq.
Tez yaddan çıxır həyatda,
Dünyadan köçənlər soyuq məzarda.

Yaddan çıxmayır el yolunda ölənlər,
Ömrüm qəlbim balıdır ey vətən.
Şəhid olanlar igid ölənlər,
Torpaq da odlanır sanki ağlayır.

İgid əsgərlərə qəlblər yaralanır,
Unudulmur el yolunda şəhid olanlar.
Yaralı ürəyimdir mənim şəhidlər,
Unudulmur igidlər el yolunda ölənlər.

Mahir qardaş şəhid olsan da,
Mənim qəlbimdə qürur yaratdın.
Desələr ki, unudacaq haçansa bacı,
İnanma öz ruhun şahiddir mənə.

Şəhidlər xiyabanı şahiddir mənə,
Qırıqdır qəlbim, yaralıdır ürəyim.
Vətənin qara günündə sızlayıram mən,
Xoş günə qayıt Azərbaycan doğma vətən.
***25.10.1995***

## SEVİRƏM SƏNİ

Sən bilmək istəsən, kimi sevirəm,
Əlbəttə gizli deyil açıq deyirəm.
Nəhayət toplasan baş hərfləri,
İndi bilərsən ki, kimi sevirəm.

Sən elə bilmə ki, sevmirəm səni,
Sənsən həyatda yaşadan məni.
İnan bircə gün görməsəm səni,
Ürək dəli-divanə eyləyir məni.

Mən səni görəndə hər dəfə inan,
Gözümdə yaş donur, ürəyimdə qan.
Bir ürək sevmişəm səni dünyada,
Bir daha qəlbən sevərdim səni.

Sizdə toy çalındı hamı sevindi,
Mənim taleyimin günəşi söndü.
O sənli günlərim nağıla döndü,
Sənin toy günündə günəşim söndü.

Mən uşaq deyiləm gənc bir yaşdayam,
Bilirəm söz nədir məhəbbət nədir.
Hər kəsin sevdiyi bir yarı vardır,
Sevgini həyatda bir vuran nədir.

## BAĞIŞLA MƏNİ

İlk dəfə səfərdə görəndə səni,
Baxışın qəlbimə vurdu həsrəti.
Niyə gizlədim sevdim səni,
Kaş sevməyəydim bağışla məni.

O gündən başladı qəmli günlərim,
Dodağımda qaldı isti dodağın.
Könlümü bağışladım sənə mən,
Gözümü yollarda qoydun o gündən sən.

İnanmışdım məhəbbətinə,
Acı verdin gecə-gündüzümə.
Zəhər imiş qəlbin sevgilim,
Deyirəm sənə bağışla məni.

Mən nə edim bilmədin qədrimi,
Məhəbbəti ucuz tutub atdın çöllərə.
Gündə birilə əyləndin sən,
Günü bu gündən unuduram səni.

Zər qədrini zərgər bilər deyiblər,
Əl atıb ürəyimə oxu çıxartdım.
Yerindən qan belə gəlsədə inan,
Sevgiyə inanmıram bir daha.

Mən dözə bilmirəm sənin əzablarına,
Gah qısqanırsan gah yada salmırsan.
Soyuq baxışların nə deyir bilmirəm,
Bağışla, bağışla mən sevmirəm səni.
Sevginə inanmıram bağışla məni.

# BİR DƏFƏ ÜRƏKDƏN GÜLƏ BİLMƏDİM

Bir dəfə ürəkdən gülə bilmədim,
Könlümü qan etdilər gülə bilmədim.
Sevgilimi doyunca sevə bilmədim,
Heyf o sevgiyə o məhəbbətə.

Məni görəndə naz edib nazlanma,
Gizli ürəyimi qan etmə.
Sən özün sevdin bəs niyə atdın,
Gizlində yanındakı o qız nədir.

Mən səni sevmişdim özümdə bilmədən,
Əlimdən nə gəlir neyləyə billəm.
Könlümdə qan ağlayır özümdə bilmirəm,
Bir dəfə ürəkdən gülə bilmədim.

Qızlarda belə bir qayda da vardır,
Məhəbbəti ürəkdə gizli saxlayır.
Sevirəm sözunu gətirməzlər dilə,
Oğlanın dərdindən ölsələr belə.

Məhəbbət şairi olsaydım əgər,
Nələr düşünüb yazardım belə.
Vəfalı qızlara bir dastan,
Vəfasız oğlanlara qəbir qazardım.

Baxdım bağa-bağçaya gözlərim doldu,
Acan güllərim soldu gözlərim doldu.
Küskün sevgilim getdi qayıtmadı,
Bir dəfə ürəkdən gülə bilmədim.

## DEDİN

Mən dedim sən dinmədin susdun,
Astaca astaca sevirəm dedin.
Hüsnündə axtardım səadətimi,
Gülərək hamısı səninindir dedin.

Zənn etdim tapmışam xoşbəxtliyimi,
Bayraq tək ucaltım öz mənliyimi.
Mənsiz keçirmədin şən günlərini,
Sən mənim çiçəyim gülümsən dedin.

O baxışlar mənimdir dedin,
Qəlbim danışmaz dinməz dedin.
Sənsiz olan günlərim göz yaşı oldu,
Sözümə inan ki, sevirəm sən dedin.

Qızılgül olsaydın iyləyərdim dedin,
Üzük olsaydın barmağıma taxardım dedin.
Ağlayanda ay cavan ağlayardım dedin,
Sözümə inanki sevirəm sən dedin.

## HƏSRƏT

Allah heç kəsi ayırmasın,
O istədiyi gözəl dilbərdən.
Ayrılıq həsrəti çəkməsin deyə,
Yaşayır ümidlə hər bir insan.

Həsrət insanı uçuruma aparır,
Ümid isə ürəyə sığal çəkir.
Mən çəkdim hər bir dərdi qəmi,
Ürəyimdə doludu qəm ilə kədər.

Həsrədir insanı uçuruma aparan,
Kim-kimi həsrətdə saxlayan.
Nə vəfasız boş dünyadır inan,
Həyatın yaraşığıdır həsrət inan.

Övlad ananı həsrətdə qoyur,
Sevən-sevəni həsrətdə qoyur.
Ümid ilə yaşayıram çəkirəm həsrət,
Çatacağam istəyimə çəkirəm həsrət.

## ALLAH

Bir yanda toydur bir yanda yasdır,
Açılmaz dünyanın dəryası Allah.
Kimisi şirin dilli kimisi acı dilli,
Daimi bəndəsinə pənahdır Allah.

Kimisi ticarətdə cib soyur,
Kimisi zindanda tir-tir əsir.
Əzablı sözlərlə yazılır sətir,
Bu dünya əzabdır, əzabdır Allah.

Ürəyim borandı qəlbim soyuq Allah,
Ana-qardaş itkinliyi gördüm Allah.
Ürəyimdə arzumu həyatımı itirdim Allah,
Bu dünya dəhşətdir, zülmətdir Allah.

Necə dözəsən bu dərdə qəmə Allah,
Gündən-günə artan zülmə Allah.
Qoy bunu el desin Allah,
Bu dünya dəhşətdir, zülmətdir Allah.

## OLDU

Ürəyim yollarda boranda öldü,
Qırdı ürəyimi bir neçə insan.
Mənim taleyim qar yağışda öldü,
Mənim xoş günümdə göz yaşı oldu.

Vətənin xoş günü sevindi qəlbim,
Göz yaşından azad xalqım oldu.
Vətən nemətindən süfrəmdə doldu,
Təkcə qənimət var mənim qəlbimdə.

Ən gözəl arzulara çatsın xalqım,
Ürəyim ancaq sevincək olsun.
Ağaran saçlarım qaralmaz daha,
Vücudum ürəyim gülsun ancaq.

Elin öz qəmi mənim qəmim oldu,
Eldən obadan düşsəmdə ayrı.
Qəbrimin üstündə el qəmi olar,
Üstümdə bitməsin gülü qürbətin.

## MƏRDLİK

Təkcə papaq qoyub bığ saxlamaqla,
Öyünüb mənəm – mən deməsin heç kəs.
Özgənin haqqını ayaqlamaqla,
Heç kəs meydanda ad ala bilməz.

Zahiri nişandır həm bığ həm papaq,
Düşünən baş olmaz həm papaq altda.
Kişilik meyyarı mərdlikdir ancaq,
Barmaqla sayılır mərdlər həyatda.

Darda sınanamışıq biz nəsil-nəsil,
Əzizimiz namərd göz dağıda olub.
Yüz dəfə min dəfə qiymətlidir,
Yüz namərd başından bir mərd dırnağı.

Adamlar xislətcə min bir saydadır,
Şəriklik günəşə torpağa suya.
Namərdin ürəyi noxud boydadır,
Mərdlik ürəyinə sığır bir dünya.

Şəri xeyir yıxır dünya üzündə,
Azərbaycana meydan var boylansın hara.
Yer yoxdur mərdlərə cıdır düzündə,
Ayaq altda qalandır xain namərdlər.

## HƏYATIM

Bir dəfə üzümə gülməyən həyat,
Dərdimi sərimi bilməyən həyat.
Gözümün yaşını silməyən həyat,
Bilmirəm hayana aparır məni.

Nə yaman acıdır acıdır həyat,
Kimisi gülür kimisi ağlayır.
Kimisi xoşbəxtdir kimisi bədbəxt,
Bir dəfə üzümə gülməyən həyat.

Qəlbimdə sanki hər dəqiqə sənsən,
Ürəyim həyatda səninlədir ancaq.
Həyatdır bizi bir-birimizdən ayıran,
Çox acı olan həyatdır-həyat.

Yenə hardan gəlib düşdün yadıma,
Həyatda acı çəkib unutmaq istədim.
Hər gün çalışırdım acı həyatda,
Saç ağartdım zülm çəkdim bu həyatda.
Lakin unuda bilmədim səni həyatda.

Həyatdır bu həyatda yaşıl yarpaq,
Hər payızda olacaq sarı xəzəl.
Gələn yazda olacaq köhnə yarpaq,
Axırı nədir qara torpaq.

## GÖZÜM YOLDADIR

Sən göyərçin oldun el yolunda qardaş,
Asta-asta uçub qeyb oldun qardaş.
Axtardım çatmadım ay qardaş,
Eldən-elə xəbərin gəlmədi qardaş.

Gəldi qara xəbərin el sızladı qardaş,
Gözüm yoldadır gəl ürəyimin parası.
Nainsaf fələk necə qıydı sənə,
Həyatımın xoş günü getdi gözüm yoldadır.

Sən gedəri evimizin dirəyi uçdu,
Bağçamızın gülləri soldu gözüm yoldadı.
Ananın qəlbi parça-parça oldu,
Qayıt gəl solğunluğu özün gör.
Gözüm yoldadır axı ay qardaş.

Hər qapı döyüləndə gözüm axtarır,
Sanki Mahirdi gələn deyirəm.
Hər an, hər dəqiqə gözüm yoldadır,
Qayıt qardaş ürəyim doludur.

***20.01.1998***

# ƏZİZ MÜƏLLİMƏ

Əlimə qələm alanda sizi görmüşəm,
İlk sinif müəlliməm sizi görmüşəm.
Əziz ana kimi sizi sevmişəm,
Arzumdur ömrünüz qoy uzun olsun.

Hər bir kəlməndə həyat yaratdın,
Hər kəlməndə vətən ana yazdırdın.
Sizinlə mən öyünmüşəm müəllimənm,
Siz mənə müəllim yox ana olmusunuz.

İndi biz əlifbanı qurtardıq deyə,
Maşallah hələki əlaçı olduq deyə.
Şükür Allaha ki, müəllimlər deyə,
Arzumdur tezliklə tələbə olasız deyə.

Mübarək olsun ilk addımınız,
Yüz yaşa dolsun əziz müəllimlər.
Fəxr edin siz öz zəhmətinizlə,
Ucalsın adlarınız əziz müəllimlər.
***07.10.2000***

## DƏRDLİ QUŞ

Uca dağlar başında bu quşa bax,
Onun qəmli gözlərinin yaşına bax.
Bu quşun qəlbi dərdlə doludur inan,
Ürəyi dərdli olanın gözdə yaşına bax.

Görəsən niyə ağlayır bu quş,
Qadaşım qeyb olub deyirdi bu quş.
Mənim də dərdimi təzələdi bu quş,
Ürəyimin qaysağını qopartdı bu quş.

Dağ-daş silkələnib göz yaşı tökdü,
Bilmək olmur heç kimin dərdin.
Sızlaya-sızlaya söylədi bu quş,
Dağlar etibarlıdır ey insan ağlama.

Dünyanı uçub dolaşan bu quş,
Dedi dağlara söylə dərdini ey insan.
Bilmək olmur insan qəlbini,
Dostluqda sevgidə aldadır insan.

Bu quş etibarlıdır yüz insandan belə,
Sevən quş aldatmır öz sevgilisin belə.
Təsəlli tapdım onun sözüylə,
Mən də şərik oldum bu quşa inan.
***25.05.2003***

## GÖZLƏRİM AĞLAR

Göyün üzü duman oldu aman,
Yer-göy çiskinə büründü aman.
Külək əsdi yağdı yağış o gəlmədi aman,
Gözlədim gəlmədi ağladı gözlərim.

Yağdı yağış ağladı buludlar aman,
Mənim də ürəyim soyudu bu an.
Könlünə daş bağladın gəlmədin niyə,
Gözlədim gəlmədi ağladı gözlərim.

Aşiq olma ay qız ürəyin ağlar,
Özünə dost tutma düşmən olar.
Sirrini qəlbində saxla ürəyini açma,
Buludlarda ağlar gözlərim ağlar.

Necə həyata inanım ay Allah,
Yer-göy fırtınadır ay Allah.
İtirdim sevgimi istəyimi mən,
Ağladı gözlərim ay aman Allah.

## EY FƏLƏK

Nədir ey fələk nə demək istərdin,
Gecə-gündüz dərq qəm içindəyəm.
Ürək deyir sakit ol qəm yemə,
Vaxt gələr ürəyin açılar gülər.

Quşlar cəh-cəh vurub bu gün səhər,
Eşit səsini qulaq as gör nə deyir.
Onlar da bir-birinə ürəyin açır,
Neçə arzuları puç etmə ey fələk.

Səsini səsimə qat deyir quşlar,
Qanadı sınmış quş olma deyir.
Qanad aç, uç göyə gör buludları,
İnan həyata dəymə mənə ey fələk.

Kimisi xoşbəxtdir kimisi bədbəxt,
Kimisi varlıdır kimisi kasıb.
Kimisi insandır, kimisi vəhşi,
Ayır onları bir-birindən ey fələk.

# İZİN QALDI

Ürəyimdə xal qaldı sevgilim,
Ürəyimdə ürəyinin izi qaldı.
Əlimdə əlinin izi qaldı,
Kökündən qurumuş ağacam mən.

Əllərim əlinə dəymir nə vaxtdır,
Sanki həyat sönüb mənə nə vaxtdan.
Ömrüm mənasızdır nə vaxtdan,
Vallah yaşamaq eyib gəlir mənə.

Ömrümdə ömrümün izi qaldı,
Yollarında gözümün həsrəti qaldı.
Ömrümə bir gün qalsa da belə,
Hər zaman ürəyimdə qalacaq izin.

Həyatımın üzü döndü, sevgilim,
Taleyimin çırağı söndü sevgilim.
Sən məni qəm əlində qoydun sevgilim,
Qopardın həyatdan izin qaldı sevgilim.

## İSTƏRƏM

Uca dağların başında quşa bax,
Onun qəmli gözlərinin yaşına bax.
Həzin-həzin oxuyurdu ürəkdən belə,
Ürəyimin qəmini dağıdmaq istərəm.

Qəlbimə sərinlik istərəm,
Sevgilimi görmək istərəm.
Dalğın-dalğın dəniz istərəm,
Mən səni dönə-dönə görmək istərəm.

Sevmişdin bəs niyə atdın,
Ürəyimə girib qəm qoydun.
Gecə-gündüz gözümü yolda qoydun,
Geri dönməyini Allahdan istərəm.

## ANA

Axtarıram hər an səni ana,
Dərdimi qəmimi dağıdmaq üçün.
Gözlərim ağlayır sənin üçün,
Ürəyim səni istəyir ana.

Məzarıstan dağ çəkdin mənim qəlbimə,
Vaxtsız apardın gözəl anamı.
Daşlar arasında layla çaldın,
Nə tez qoynuna aldın anamı.

Ana gəldim ziyarətinə sənin,
Qışqırıb ucadan səslədim səni.
Övladların boğulur qəm içində,
Qalx ayağa eşit səsimi ana.

Əlimdə var ilahi Quran,
Dərdli insanlara oldum səbəbkar.
Allaha yalvarıb kömək istədim,
Günah qazanmadım dünyada ana.

Hörmətim var, izzətim var el yolunda,
Düşməndən çox dostum var el yolunda.
Sən rahat ol qoruyuram bacı-qardaşımı,
Anama rəhmət qazandım el yolunda.

## MÜƏLLİM

Ömür boyu əzab-əziyyət çəkən,
Tələbələrinə sevincindən pay verən.
Həsrət ilə hər kəlməsində hərf deyən,
Qəlbi dolu müəllimdir müəlllim.

Bütun saatı lövhə qabağında,
Sevinc ilə o köksünə sıxanda.
Hər şagirdi naz ilə oxşayanda,
Dünya quranlar məllimdir müəllim.

Gecə gündüz şagird üçün çalışan,
Ömür boyu yaradıb quran.
Həyatda neçə gənci çalışdıran,
Ümid verən müəllimdir müəllim.

İlk şagirdlərə ana olan sənsən,
İlk qələm tutmağı öyrədən sənsən.
Əlifbanın neçə sirrlərini açdın,
Neçə həkim, mühəndis yaratdın.

Allah qoy sizə yar olsun müəllim,
Ömrünüz gününüz çıraqban olsun.
Zəhmətinizin bəhrəsi sizə yar olsun,
Fəxriniz, adınız ucalsın müəllim.

## ƏSGƏRLİK

On səkkiz yaşına təzəcə doldun,
Heç özün də bilmədən.
Bir gün də əsgər oldun,
Vətənə gərəkli bir oğul oldun.

Ayağına çəkmə geyəndən bəri,
Bir-iki oldu dillər əzbəri.
Özüm də olmuşam zabit nökəri,
Düşmənin belini qırdıq o gündən.

Bax beləcə keçir günü əsgərin,
İlk gecələr kazarmada yatanda.
Ahu-zarə göyə çıxır əsgərin,
İsti ana qucağı düşür yadına.

Yatmaq üçun səkkiz saat gərəkdir,
Yediyimiz qara çörək kaşa gərəkdir.
Mən deyirəm belə yerdə dost gərəkdir,
Sözünü eşidən yoxdur əsgərin.

Belə yerdə anam düşdü yadıma,
Bişirərdi kələm yarpaq dolması.
Necə də çətindir əsgərlik illəri,
Gözləri yaş ilə dolur saldatın.

Paltarın cırılanda tikirəm özüm,
Əlimə alıram o iynə-sapı.
Özümü bir anlıq dərzi sanıram,
Günü-güzaranı belə keçir əsgərin.

## HABİL AĞLAYIR

Qərənfillər soldu Habil,
Qol-qanadım sındı Habil.
Şəhidlər məzarı üstə,
Ağladı kamança Habil.

Kamança eylədi fəryad,
De heç yaraşmır Azərbaycana.
Neçə şəhid büründü al-qana,
Kamança ağladı, Habil ağladı.

Oxşama dedi ana ürəyinə,
Ağlama ana şəhiddir el yolunda.
Dözmədi kamança Habil bu dərddə,
Layla çaldı neçə körpə balalara.

## AZƏRBAYCAN

Qoy mən ölüm torpaq üçün,
Qarabağım sənin üçün.
Çünki mənim ürəyimsən,
Ana vətən Azərbaycan üçün.

Mən şəhid olsam el yolunda,
Göz yaşı tök ana el yolunda.
Yaratdın sən məni Vətən üçün,
Vətəni düşməndən azad etmək üçün.

Ey Vətən var neçə igidin,
Koroğlun Kərəmin Nigarın.
Qeyrətli oğulların qeyrətli qızların,
Var gəlinlərin Azərbaycanım.

Azad edəcəklər torpaqlarımızı,
Laçını Kəlbəcəri Tərtəri.
Şuşanı Füzulini Ağdamı,
Doğma Azərbaycan torpaqlarımızı.

Sən xoşbəxtsən Azərbaycan,
Var qoynunda zərin zərgarın.
Mən sənə baş əyirəm ey Vətən,
Qarabağım, vətənim Azərbaycanım.

Ey Tanrı bağrımı qan eyləmə,
Sinənimi çalın-çarpaz qan eyləmə.
Vətənimi al-qana xəlman eyləmə,
Vətənimi düşmən tapdağı eyləmə.

Vaxt gələr işıq saçar Azərbaycan,
Qaranlıq gecənin işıqlı səhəridə var.
Alınar torpaqları ucalar başı,
Məndə fəxr edərəm Azərbaycanım.

## GÖRMƏK İSTƏRƏM

Səni görməyə adət etmişəm,
Bu adət məhəbbət deyil?
Səni görməyəndə xiffət etmişəm,
Bu xiffət məhəbbət deyil?

Üzümdə göz yaşı gördüyün zaman,
Demə ağlayıram barışmaq üçün.
Ağlayıram hər zaman sənə inanmağıma,
İnandığım kimi unudacam səni.

Taleyin üzü sərindir Allah,
Eşqimin özü şərtdir Allah.
Unutmaq yaman dərddir Allah,
Səni hər zaman görmək istərəm.

## AYRILIQ

Məni yaman dərdə saldı ayrılıq,
Mənim göz yaşlarımdı yaman ayrılıq.
Mən sənə inandım inan sevgilim,
Gündüzüm gecə olub yaman ayrılıq.

Heç bilmirsən mən necəyəm indi,
Gülər üzüm gülməyir indi.
Sənsiz elə bil gündüzüm gecədir,
Mənim göz yaşlarımdı yaman ayrılıq.

Həsrətini çəkirəm ay aman,
Sevən-sevəni heç unudarmı.
Mənim Vüsal eşqimi unutsanda,
Mən səni xəyallarımda yaşadacağam.

Məhəbbət təbii çiçəkdir,
İyləyib-iyləyib xoşallanırsan.
Dərib əllərində dəstə tutursan,
Əlindən atanda soldu demə sən.

## MƏHƏBBƏT

Məhəbbət ümidin yadigarıdır,
Ülviləşir gücləndirir hərarətlidir.
Ürək damarların parlaq yadigarıdır,
O həyatın böyük bəzəyi hərarətidir.

Zaman keçir qocalır insan,
Ümidi qırışır ilk məhəbbətin.
Ürək bağlayır ailə məhəbbətinə,
Övladı olur ona məhəbbət yadigarı.

## GECƏLƏR

Yaradıb ulu Tanrı sakit gecəni,
Ulduzlar seyr edib göy üzünü.
Düşünüb xəyallara dalıram,
Ulduz olub qalxardım sakit gecəni.

Mənə ümid verən sakit gecəni,
Hər gün həyatıma şərik olan.
Ürəyimin qəminə şahid gecə,
Hər işıqlı səhərin sakit gecəsi.

Səninlə nəfəs alıram ay gecə,
Sən mənim məhəbbətimsən ay gecə.
Nə boran tufan poza bilməz,
Dünyanın sakitliyi gecədir gecə.

Günəş qoynunda dincələr yatar,
Ulduzlar sənin ətrafında yatar.
Mənim qəlbimdə səninlə olar,
Düşünüb xəyallara dalıram gecələr.

## DƏLİ KÜR

Nə coşubsan özündən dəli Kür,
Qoynuna gəlmirmi yazığın.
Sahillərin darma-dağın,
Yuyub hara aprırsan dəli Kür.

Nə qəribə xasiyyətin var,
Gah sakitsən gah dəli.
Dünyanı sellərin alıb qoynuna,
Danışma dayan ay dəli Kür.

Gözəlsən yaraşıqsan,
Min dərdə dərmansan.
Şirinsən dadlısan,
İnsanlara həyatsan.

Kür sakitləşdi bir an,
Mən danışıram yazda ancaq.
Neyləyim səbr kasam dolub,
Bu xasiyyətimdir, mənim ancaq.
***12.04.2003***

## GÖYƏRÇİN VƏ BÜLBÜLÜN EŞQİ

Eşqə düşüb bir bülbül,
Şirin dilə saldı göyərçini.
Göyərçin inanıb bu məhəbbətə,
Könül verdi, bir bülbülə.

Çox sürmədi bu məhəbbət,
Get-gedə soyudu bülbül.
Göyərçinin gözləri qaldı yolda,
Vəfasızdı bu bülbül.

Nə gözəl oxuyardı bu bülbül,
Yaraladı göyərçin ürəyim.
Gözəl təmiz qəlbinə saldı qara ləkə,
Göz yaşı tökdü bülbül üçün.

Göyərçinin gözləri qaldı yolda,
Günləri saydı qəmli-qəmli.
Gəlmədi o bir daha,
Özünə qurdu başqa yuva.

Sızladı ağladı göyərçin,
İnanmıram mən daha məhəbbətə.
Bülbül üzr istəsə də bundan belə,
Bağışlanmaz göyərçin qəlbi.

## ŞAMAXI

Gəldim görüşünə ümidimi qırma,
Sevindir güldür qəlbimi qırma.
Baxıram dağların gözəlliyinə,
Şırıl-şırıl axan bulaqlarına.

Qız kimi həya var ətəklərində,
Başında var gəlinlik tacın.
Qüvvət gəlsin sənin qollarına,
Yaraşırsan elim Azərbaycana.

İnsanların gözəldir qonaqpərvərdir,
Ürəklərə yol tapan insanlarına.
Alışdım ilk gündən Ceyran anaya,
Bəd nəzərdən uzaq olsun Babam evi.

Qəlbim külək kimi əsir,
Sənin görüşünə tez tələsir.
Yatmayıb gecə gündüz baxıram sənə,
Ürəyim sevinir babam evində.

İsti yayman, sərin havan,
Dadın damağımdan getmir inan.
Reyhan gözəlliyi Rəna şirinliyi,
Füzuli qoçaqlığı çıxmır yadımdan.

Yaraşırsan sən Azərbaycana,
Neçə şairin neçə igidin var.
Gəlirəm hərdən görüşünə,
Ümidlərim qırılmasın deyə Şamaxı.

Təki sən tərk etmə məni,
Sənin bulaqların xoşdur mənə.
Çiskinlərin içində üzərəm mən,
Qoşa ürəyimin arzuları ilə.
***15.04.2003***

## QARABAĞIM

Şuşam, Laçınım, Kəlbəcərim,
Füzulim, Xocalım, Ağdamım.
Ümidlə gözlədiyim Qarabağım,
Səni görmək üçün Qarabağım.

Gözlərim yaşarır könlüm sızlayır,
Günləri illəri sayıram mən.
Doğma ellərimiz qayıtsın deyə,
Azərbaycanın ümidləri Qarabağım.

Bülbüllər qoynunda cəh-cəh vurardı,
Könüllər mülkündə laləzardır.
Qızıl sərvətinlə tanınardın,
Qanlı Qarabağımı, qurtar Allah.

Seyrə çıxardıq dağlarına,
Lalən bənövşəli sərin elinə.
İndi top-tüfəng səsin eşidirəm,
Ürəyim parça-parça olur Qarabağım.

Düşmən əsirindən qurtarsın elim,
Neçə-neçə qurbanları qəbul olsun.
Çal-çağır səsin gəlsin,
Xoş gününə yığışaq Qarabağım.
***22.04.2003***

## DƏRDLİ LALƏ GÜLÜM

Yol izimin yadigarı lalə gülüm,
Bir-birindən ümidli lalə gülüm.
Bir ləçəyi böyük bir ləçəyi kiçik,
Ürəyi böyük dərdli lalə gülüm.

Gözünə necə sataşdı bu gül,
Neçə qanqal içində bu gül.
Mənə bəxş etdin ürəyini bu an,
Küslü ürəyimizi barışdırdı bu gül.

Sənə ümidlə baxıram sevgi gülü,
Dağlara dərələrə yaraşıqsan lalə gülü.
Mənim kimi küsülü qəlblərə,
Yaraşıqsan ümidsən lalə gülü.

O gündən saxlaram səni yadigar,
Sevgim qırılsa da saxlaram səni.
Lalə mənə ümid verib qırılsa da qəlbim,
Ömə, məhəbbətə yadigardı lalə gülü.
***20.05.2003***

## DARIXMA DEYİR

Sənin lal qalmağın darıxdırır məni,
Oxuya bilmirəm bağlı qəlbini.
Üzüm gülsə də qəlbim ağlayır,
Ürəyim od tutub alışır yanır.

Hər gün mənə darıxma deyir,
Bir gün gələr bitər dərd-qəm.
İnanmıram mən o günə,
Əksinə ürəyimə qəm yuva salıb.

Gözlərin mənə deyir ancaq,
Sevirəm mən səni ancaq,
Hərəkətlərin azdırır məni,
Şübhə edirəm mən sənə ancaq.

Gələn hər günüm bir ilə bərabərdir,
Sənin həyan mənə qəmə bərabərdir.
İnsan ömrü qəmdir qüssədir,
Qəmli üzün gülsün deyirəm ancaq.

Hələki səni gözləyirəm sevgilim,
Yaşayıram ümidlə sevgilim.
Gecə-gündüz qəm içindəyəm,
Gözləyirəm mən səni sevgilim.

Yüz telim həsrətdən ağarıb Allah,
Bircə dən bir acı sözündən düşdü.
Eşqinlə yaşayıb gözləyirəm mən,
Darıxma deyirsən darıxıram mən.
***30.07.2003***

## ALLAH VER ONUN BƏLASIN

Allah sən yaratdın gülü-çiçəyi,
Gül-çiçək içində qanqal bitməsin.
Sevən qəlblər güldür çiçəkdir,
Aldadan qəlblər qanqaldır ancaq.

Kaş ki sənin qanqal ürəyin,
O şirin dilini görməyəydim.
Aldanıb o şirin dilə Allah,
Kaş sevməyəydim yalan ürəyi.

Səni sevsəm də ürəyim bilməyəcək,
O vəfasız qəlbinə aldanmayacaq.
Aldatdın sən gülü, çiçəyi,
Qoy Allah versin sənin bəlanı.

Gündə bir gözələ eşq oxuyursan,
Qönçə ürəklərə xal niyə salırsan.
Allahı görmədin başın üstə,
Qoy Allah versin sənin bəlanı.

Qarğış etmirəm mən sənə,
Bəlkə də Allah düzəldər səni.
Bir gün peşman olarsan sən də,
Qapımdan girib üzr istəyərsən.

Allah bağışlayandır gəl düz yola,
Aldanıb kiminsə şirin dilinə.
Öz məhəbbətini itirirsən sən,
Qoy Allah versin sənin bəlanı.
***30.07.2003***

## GÖZÜM YOLDADIR

Gözləyirəm hər an yolunu,
Qəm-qüssədir hər anım.
Gözlərim dolur, boşalır,
Ümidlə yaşayıram mən də.

Sevdiyim o an kaş olmayaydı,
Səni gördüyüm o an öləydim.
Allah ayrılıq edibsə bundan belə,
Mən ümidlə yaşayacam bundan belə.

Hər dəqiqə səndən xoş söz güdürəm,
Acı dillərinə mən necə dözüm.
Sən ki belə deyildin ay dili-qafil,
Gözüm yoldadır ay dili-qafil.

Dərd-sərimə şərik olmadın,
Ancaq özün üçün yaşadın.
Uzaq-uzaq elləri qəm-qüssə etdin,
Gözüm yoldadır ay vəfasız.

Mənim qəlbimi yaraladın,
Kaş ki mən olmayaydım.
Mənə həyatı zindan etdin,
Aşiqəm sənə gözüm yoldadır.
***03.07.2003***

## MEHMANAM ELLƏRİNƏ

Torpağı bol bəhrəli,
Çayları göz yaşıdır.
İsti suyu can dərmanı,
Lənkərana mehman oldum.

Sübh səhəri nə gözəldir,
Günorta yağır damcı yağışın.
Gah isti günəş çıl-çıraqdır,
Gah buludlar ağlaşırlar.

Necə də asfalt enli-yaraşıqlı,
Sanki dil olub deyir Lənkərandır.
Cəlilabad, Masallı qoldur budaqdır,
Kötük salan Lənkərandır.

Neçə alimin adın sanın var,
Qonaqpərvər evlərin var.
Qəydər evi yardır-yaraşıq,
Süfrəsi bol bəhrəsi var.

Səkkiz qız Qəydər anaya yaraşıq,
İki oğul qoldur qanaddır.
Qoy Allah onlara kömək olsun,
Mehman oldum bu evə məndə.

Sürücü ayaq saxla tələsmə sən,
Gəl ziyarət et bu məkanı.
Dolan qarış-qarış Lənkəranı,
Azərbaycanın yaraşığı Lənkəran.

## YAD OLDUN MƏNƏ

Tək qalmağına necə şadsan,
Mənim tək qalmağıma necə şadsan.
Ahu-zarım cıxıb dağa-daşa,
Nə biləydim ki sən mənə yadsan.

Üz-üzə gələndə məni çaşdırma,
Qaş qabağını töküb acılama.
Gəlmişəm sənin əlindən zara,
Gəl məni çaşdırma ay vəfasız.

Dərdlərin ürəyimi parçalayıbdır,
Göz yaşlarım axır neyləyim.
Qəddarsan üzün gülsün ay zalım,
Nə biləydim ki sən mənə yadsan.

Gündə gəlməsən sevinmə,
Ürəyin-ürəyimə bağlıdır inan.
Qəmdir-qussədir hər günüm mənə,
Nə biləydim ki sən mənə yadsan.

Göydə buludlar ağlayır inan,
Yerdə dənizlər coşur inan.
Torpaq ayağımın altında yanır,
Nə biləydim ki sən mənə yadsan.

## ANALARIN RUHU

Anaların ölmü bir faciədir,
Körpə balalara bir faciədir.
Didərgin düşər körpə balalar,
Gözü yaşlı qalar körpə balalar.

Ögey anaya qismət olmasın körpələr,
Ac-susuz qalmasın körpələr.
İsti ana qucağına həsrət qalar,
Ağlamayın sızlamayın ay körpələr.

İlham kimi ata sən çat köməyə,
Ögey ana əlindən al onları sən.
Analar ruhun şad et sən,
Ruhları da canlarıda daha sənsən.

Allah sənə yar olar İlham,
Bütün dərd bəladan qoruyar İlham.
Dirəksən bütün körpə balalara,
İsti nəfəs ver körpə balalara.

Qədəm qoy körpələr evinə İlham,
Gendən dur bax sən onlara.
Yetimin üzündə cizgilər olar,
Sənə bir yüksəlişdir anaların ruhu.

İlham adı yaraşır sənə,
İlham verdin neçə körpəyə sən.
Qoy Allah sənə yar olsun,
Dərd bəladan uzaq olasan sən.

El-obanın igid oğlu İlham,
Meydanda tək qalmassan sən.
Adına yazıram şeir mahnıda,
Mən Mirzəyeva yazır bunun hamısın.

İlham kimi oğul ver Azərbaycana,
Qoy şad olsun ruhunuz analar,
Körpələriniz qalmaz tində bucaqda,
İlham kimi oğulumuz var Azərbaycana.

Solğun çiçəklərə bənzəyir yetimlər,
Vaxtından tez qırılır yetimlər.
Zəhmətkeş analar bağçada gül-çiçəkdir.
Körpə balalar onlara güldür-çiçəkdir.

Mirzəyevlər ocağına ad-san qazandın,
Anana-atana bir ad qazandın,
Səngərdə şəhid oldu Mahir Mirzəyev,
Analar qəlbində ad oldu İlham Mirzəyev.
***04.08.2003***

# BAĞIŞLA

Əsgərlik vaxtından qayıdan zaman,
Hər yanı gül kimi çağlayan gördüm.
Lakin canım qədər sevdiyim qızı,
Başqa bir evdə mən gəlin gördüm.

Dedi gəl bağışla, bağışla məni,
Zor ilə pozdular məhəbbətimi.
Onun qucağında körpə görəndə,
Bütün məhəbbəti pozulan gördüm.

Necə bağışlayım dedim mən səni,
Qırmısan sən mənim qəlbimi ay qız.
Bir vaxtlar var idi, sevirdin məni,
İndi bilirəm ki sevmirdin məni.

Dedi ki sevgimiz keçdi məzardan,
Diz çöküm bu saat mən qabağında.
Yalvarıram sənə bağışla məni,
Sərçədən bülbülə dedim yar olmaz.

## XATİRƏ

Xatirə yazıram mən həyatıma,
Göydə parıldayan mavi ulduza.
Həyat müvəqqətidir dan ulduz kimi,
Göylərdə sarmaşan buludlar kimi.

Əzizim sevirəm həyatda hamını mən,
Vəfalı olun sizdə mənə həyatda.
Əvvəli açılan güldən çiçəkdən,
Sözlərimi deyirəm təmiz ürəkdən.

Mən şair deyiləm qəlbim incədir,
Dilim söyləyir ürəyim deyəni.
El bilir ki anam yox sözüm deyəni,
Yazıram ki ömürdən yadigar qalsın.

## RUS QIZI

Bir rus qızının xətrinə dəydim,
Rus dilini bilmirəm bəyənmir məni.
Eşqimi açmağa bir az utandım,
Bir az utancağam bəyənmir məni.

Bildi ki mən sevirəm onu,
Söylədi siz elə hamını sevirsiz.
Sevginiz gah ona, gah buna qalır,
Bu rus qızı bəyənmir məni.

## MƏHƏBBƏT

Məhəbbət alovu iki qəlbi bir anda,
Eşqin asimanında çıraqban olsun.
Ömrü günü müəyyəti arzunu məhəbbəti,
Ömrümün gözəl həyatına ilk qədəm olsun.

Ən acı vaxtımda məhəbbət mənə yar ol,
Qəmli göz yaşımda səadətimə qədəm qoy.
Sevgi bu mənalı söz həyata yar ol,
Bütün sevən ürəklərə qədəm qoy.

## LAYLA

Layla dedim körpə balama,
Şirin yuxu ver körpə balama.
Ömrüm günüm həyatım,
Şirin yuxu ver körpə balama.

Dolansa yüz bahar gəlsə soyuq qar,
Kainat sussada taleyim yatsada.
İldırım çaxsada günəş batsada,
Balama laylay deyərəm Layla.

Sənsən mənə ömür verən körpə balam,
Ailənin gülü çiçəyi körpə balam.
Ananın göz işığı körpə balam,
Balama layla deyirəm körpə balam.

## HƏYAT MƏNİ SINAYIR

Dözürəm bütün əzablara,
Sanki ürəyimə daş bağlanıb.
Hər bir dəqiqə hər bir saat,
İllərlə ayaqlaşıb gəlir əzabla.

Aha-naləyə düşdüm bu həyatda,
Hansı bir insanın ahına düşdüm,
Şeytanlar qələm çaldı həyatıma,
Hər bir əzabları çəkdim həyatda.

Demə həyat məni sınayırmış,
Görüm dözəcəkmi mənim bu bəndəm.
Allahın ən gözəl bəndəsi əzaba dözür,
Çünki həyat sınayır məni.

Bir insan düşünüb salın yada,
Onda sevinc olsun, qübar olmasın.
Hörmət edirəm hörmətə çatmaq üçün,
Çünki həyat sınayır məni.

## ÜRƏK YARASI

Qönçə güllərim açıldı,
Sınmayan qəlbim sındı.
Ağrımayan başım ağrıdı,
Ağrımayan ürəyim ağrıdı.

Qaldı ürəyimdə neçə arzum, diləyim,
Ürək daş deyil bir parça ətdir.
İnsanı yaşadan xoş bir diləkdir,
Lakin çox çətindir ürək yarası.

Yaşayırsan bu dünyada xoş gün üçün,
Yaşama hər günü ağlamaq üçün.
Gəncliyim solsa da gülmədi ürəyim,
Lakin çox çətindir ürək yarası.

Ürək arzularım qanqala döndü,
Dünyada itirdim ömür nişanəsin.
Şirin xəyalla yaşasam da belə,
Lakin unutmaram, ürək yarasın.

## SINIQ QƏLBİM

Görmədim bu dünyada bir şirin vüsal,
Doyunca ana məhəbbəti ata nəvazişi.
Ulduzlarda göydə gözümdən düşüb,
Bu fani dünyada mənim sınıb qəlbim.

Dünyada var dövlət gəldi-gedərdi,
İstər bəstəkar ol, istər şair ol.
Pinəçi, dərzi, alim olsan da belə,
Göz yaşı sındırar sınıq qəlbini.

Bivəfa dünyadan köçəni olsam,
Nainsaf fələk güldürmədi məni,
Bir atəş yandırır sınıq qəlbimi,
Soyuq məzarıstan söndürər onu.

Əzrail, al canımı qəlbim sınıqdır,
Çiçəkli həyatım qanqal olubdur.
Qoy ömür ulduzum əbədi sönsün,
Sözüm qalmasın sınıq qəlbimdə.

Gələcək həyatda sözüm qalsın,
Ziyarətimə gələnlər ağlamasın.
Məni sevəndə sevməyən də,
Şeirimi oxuyub qəlbi sınmasın.

# VƏSİYYƏTNAMƏ

Cavan ölsəm ey həyatda qohum-qardaş,
Qırmızı çadraya bürüyün layla deyin.
Oxşama deyin anam-qardaşıma,
Çünki açan gül nə vaxtsa solur.

Məzarıstan gözəldir gəlin ziyarətimə,
Mən sizə söyləyim qəribədir bu həyat.
Kimi ana çiynində, kimi övlad çiynində,
Məni də yola salın elin çiynində.

Məni ürəyinizə dərd eyləməyin,
Qoy övladlarım xoşbəxt olsunlar.
Məni də qovuşdurun anama,
Qoy şirin vüsala qovuşum o an.

Deyirəm bu iki kəlməni sizə,
Yazarsız baş daşıma bu sözü.
Ürəyimdə qalıb neçə arzu-istək,
Cavan ölüm haqlayıb fani dünyada.

Dünyaya gəldim təmiz ürəklə,
Torpağa qoyuldum təmiz niyyətlə.
Yaşa övladlarım təmiz ürəklə,
Torpaq götürmür çirkin ürəyi.

Çağladı sular dalğalandı dəli çaylar,
Qəzəbləndi göy üzü ağlasa da buludlar.
Yandı yer üzü düşdü ayrılıq,
Cavan ölüm haqladı fani dünyada.

## SEVGİLİM

Qırdın qəlbimi sevgilim,
Arzunu istəyini niyyətini.
Demə ki vəfasızsan sevgilim,
Qismətdir istəyi ayıran.

Mənəm bədbəxt bu dünyada,
Kor kimi gəldim dünyaya.
İşıqlı gözlərim ola-ola,
Kor kimi yaşadım dünyada.

Sən çəkdin mənə ahı-naləni,
Qılınc çəkdin iki kəlmə sözünlə.
Mənim kimi xoşbəxt olasan,
Mənim kimi bədbəxt olasan.

Necə dilin gəldi qarğıdın mənə,
Sevən sevəni qarğımaz belə.
Mən sənə xoşbəxtlik arzu edirəm,
Çünki sənin ağır günün mənə dərd olar.

## AMAN AYRILIQ

İlk dəfə mən səni yolda görmüşəm,
Elə oradaca sevdim demişəm.
İndi ayrılaraq bu soyuq qışda,
Ömrün o baharı o yağışında.

İndi sən özgəsən mən yadam sənə,
İndi yadlar sənə doğmalaşıbdır.
Deyirəm özüm-özümə səni niyə sevdim,
Sevən-sevəndən tez ayrılarmı.

Sözümə baxmadın yan ay ürəyim,
Mənim daş ürəyim peşman ürəyim,
Gözlər oxudular qəlbdən keçəni,
Utandı baxışlar qızardı üzlər.

Baxışlar çəksəydi ürək çəkəni,
Yanıb kor olardı yəqin ki, gözlər.
Unutmaz sevən-sevəni heç vaxt,
Ayrılıq güc gəlsədə mənə.

Sevmək çox çətindir dedim axı,
Eşqi məhəbbəti bilməzsən axı.
Eşqi yandırıb tezdə söndürdün,
Aman ayrılıq aman ayrılıq.

## ŞAMAXI

2002-ci il 17 noyabrda,
Oldum qonaq Ərəbşahverdidə.
Gecə-gündüz yatmadıq,
Olduq qonaq Ərəbşahverdidə.

Götürdüm qələm-kağızı,
Şair sayaq bu Şamaxıda.
Nəğmə dedim şeir yazdım,
Necə gözəl bir ailədə,

Coşdu təbim çaylar kimi,
Oldum bulaq başında Şamaxıda.
Bu gözəl ailə oldu dost o gündən,
Şirin sözlü söhbətdi bu ailə.

Var gücümü sərf edərəm ürəklə onlara,
Kömək əlimi əsirgəmərəm ürəklə onlara.
Naz-nemət arzu edirəm ürəklə onlara,
Xalqım üçün çalışaram ürəklə inan.

Ayrıldım gələndə qucaqlaşaraq,
Sanki körpəlikdən burda böyüdüm.
Mən fəxr edirəm xalqım ilə,
Necə gözəl hörmət qazandım deyə.

Gözlərim yaşardı ayrılırdım mən,
Nurdan yaranıb onların baxışı.
Dostluqda dostdular bu Şamaxılılar,
Yar yaraşıqdı Azərbaycana bu Şamaxı.

## YAZIQDI

Uyub kef damaqda əyləncələrə,
Həyatı oyuncaq bilən yazıqdı.
Vurulub min kərə, sevib min kərə,
Sevgini duymayıb ölən yazıqdı.

Dünya öz işində dünyaya nə var,
Vaxtından gələcək ətirli bahar.
Qəlbində ögey hiss ögey duyğular,
İllərlə şadlanıb gülən yazıqdı.

Ayıra bilməyən qurunu-yaşı,
Yadından çıxaran dostu-yoldaşı.
Özündən dəm vuran hər addım başı,
Nadanlıq sazını çalan yazıqdı.

Yıxılan yıxılsın mənə nə deyən,
Böyüklər önündə başını əyən.
Yasda qəmlənməyən kədərlənməyən,
Mənlikdə birinci gələn yazıqdı.

Dünyanın çiynində ağır yük olan,
Hər sözü şübhəli hər sözü yalan.
Gecəsi iftira gündüzü yoran,
Axırda tək-tənha qalan yazıqdı.

## SAĞLIQ DEYİN AY DOSTLAR

Çoxdandır bir xahiş etmisən məndən,
Sənə bir xatirə yazım sinəmdən.
Xatirəm əbədi yaşasın deyə,
Məndə müraciət etdim ürəyə.

Ürək fikrə getdi düşündü bir az,
Buyurdu mənə ki səndə belə yaz.
Dostunla mehriban olmaq istəsən,
Çalış dar ayaqda qoyma onu sən.

Onda bilərəm ki həqiqətdə sən,
Özündən də artıq onu sevirsən.
Dostunun evində dartma özünü,
Ədəb-ərkan ilə danış sözünü.

Dostunun qəmini qəm bilməlisən,
Şadlıq mərasimi qurulub bu gün.
Şadlıq günündə də sevilməlisən,
Çalınır həyatda bu toy bu gün.

Bu toy günlərində sevinirəm mən,
Təbriklər deyirəm bu gün dilimdən.
Qoy onlar bu evdə yaşa dolsunlar,
Şad yatıb hər zaman şadda dursunlar.

Qohumlar-qonşular həsrətlə baxsın,
Xain ürəklərə tikanlar batsın.
Bu evdə qız oğul toyu başlasın,
Eşidən dost-tanış qoy alqışlasın.

Təbriklər söylənsin xoşbəxt ailəyə,
Meyillər doldursun ağ piyaləyə.
Sağlıqlar söylənsin can sağlığına,
Dostun Minayə dursun dost qulluğuna.

Ürəkdən dostlara sağ olsun desin,
Məclis bu sağlığı qoy qəbul etsin.
Yoldaşım Fəxrəddin dolsun 40 yaşa,
Mübarək deyək ürəkdən 100 yaşa.

## ÖMÜRDƏN GEDİR

Ey dil cahana uyma ki ömürdən gedir,
Əldən tamam zəri xaniman gedir.
Mürc olma ömrünə ömrün vəfası yoxdur,
Baxmaz bu yolda yoldaşa rəqibə dost yoxdur.

Beş gündür bu cahan yaxşı-yaman gedir,
Getdi anam-qardaşım ömrün vəfası yoxdur.
Verməz əcəl gələndə sənə verməz aman gedir,
Onda nə mala-mülkə baxarsan nə də dövlətə,
Naz ilə bəslədiyin cismə ömürdən gedir.

Məstanə gözlərin dolacaq torpaq ilə,
Mümkün xəta gözəlliyi rəvan gedir.
Yığışıb qohum-qardaş bir müddət yad edir,
Elə hesab edəcəklər məndə mehman gedirəm.

Bu fani cahanda etmə günah inan,
Təmiz duyğularla sevgi cahanı ömürdən gedir
Yaşa insanları yaşatmaq üçün ömürdən gedir,
İnsan xoş arzu xoş dilək yetir.
Axırı məzarıstandır hər şey ömürdən gedir.

## ÇÖRƏK

Nurdan yaranıb nur danəsidir,
Olubdur dünyanın andı çörək.
Gör necə də kəsərli necə ümiddir,
Bıçağın paslanmış tiyəsi çörək.

Ruhum qida alır çəsəm adını,
Hər kəs görməsin aclıq odunu.
Zəhmətin çəkməyən bilməz dadını,
Anasız uşağın anasıdır çörək.

Görüm ki heç kəsi darda qalmasın,
Çörəksiz yemərəm kələm dolmasın.
Heç vaxt bizdən kənar olmasın,
Süfrənin birinci tikəsi çörək.

Könüllərin soltanıdır bəyidir,
Zəkanın dəryası güc mənbəyidir.
Ömür sarayının şad dirəyidir,
İnsanın isməti həyası çörək.

Sözümü söyləyərəm hər bir nəfərə,
Çörək atılmasın zibilliklərə.
Xəyal məni çəkir qanlı illərə,
Uğurlu yolların zəhməti çörək.

Dəmirçi oğlunun ol yaraşığı,
Çörəksiz axtaran varmı aşığı.
Əslim Səlyanlı özüm Quranlı,
Ürəyimin taqəti qüvvəsi çörək.

Gözümü açandan çəkdim əzablar,
Zəhməti çəkdim qazandım çörək.
Qabarlı əllərimin zəhməti çörək,
İnsanın həyatı qüvvəsi çörək.

## GEDİR

Ömür eniş-yoxuş bir yola bənzər,
Arifdə alimdə nadan da gedir.
Yüz nemət yetirən torpaq altına,
Yüz-yüz insan belə bir anda gedir.

Onun qanunada ədalətə bax,
Məzarda heç kimə yandırmır çıraq.
Kimliyin soruşmur bu qara torpaq,
Ona xan da gedir çobanda gedir.

Dünya nə şirindir ey Vətən oğlu,
Baxdıqca insanın gözləri dolur.
Heyf ömür adlı bu gözəl yoldur,
Tanımazda gedir qanan da gedir.

Bir insan düşünüb salın yada,
Dünyanı tutub qalıb dünyada.
Dünyaya gələn insan haçansa gedir,
Onda da insan ölür məzarısatan olur.

Ömür bu dünyada alış-veriş deyil,
Ruhuda canıda könlüdə gedir.
Pinəçi dərzi alim fəhlədə gedir,
Tanınanda gedir nadanda gedir.

## DÜNYADA

Sağ ikən kef elə beş gün dünyada,
Beşiydə qismətin ola-olmaya.
Mən ölən zaman cənazəm qalxa,
Kimsənin gözləri dola-dolmaya.

Əcəlin əlləri qana batanda,
Fələk özünü qoruyub saxlayanda.
Qardaş gəlib tabutuna çatanda,
Bir dəfə üzüm gülüb-gülməyib.

Dünyanın şöhrəti nəyimə gərək,
Vaxt olar sinəmdə dayanar ürək.
İllərlə nazını çəkdiyim qardaş,
Bir dəfə üzüm gülə-gülməyə.

Mən gəlib başımı qoyaram başdaşa,
Deyərəm bacın tək qalıb bu dünyada.
Ariflər istifadə edir bu dünyadan,
Bir gün onlar peşman ola-olmaya.

Səninlə öyünüb səni öyənlər,
Şəhid adına canım deyənlər.
Ziyarətinə gələndə özün öyənlər,
Bir dəfə düşünə dola-dolmaya.

## GÜNAY

Səninlə öyünüb fəxr edir anan,
Günay adına and içənlər.
Şıltaqlıq edirsən sən atana,
Həsrətini çəkirlər dəcəl Günay.

Allah səni tək etsədə belə,
Gün və ay dostdurlar sənə.
Bu həyatda hədiyyəsən mənə,
Atasının istəylisidir Günayım.

Hər ağızdan çıxanı yozur mahnıya,
Şirin-şirin danışır Günayım.
Gözləri süzgün baxışlı Günayım,
Ürəyi kövrək gözəl qızım Günayım.

Atanın, ananın andısan,
Uca dağların qarısan.
Sağlam olasan arzuna çatasan,
Xoşbəxtlik səadət tapasan Günayım.

Gün kimi parlaq ay kimi gecə,
Gah şirinsən gah acısan.
Axırki dəcəlsən dəcəl,
Atasının, anasının yaraşıqlı,
Şirin dilli dəcəl qızım Günayım.

## QURTAR MƏNİ BU DƏRDDƏN AY ALLAH

Həyatın xoş günün mənə çox görürsən,
İşıq gələn günlərimi hörürsən.
Mən zülmlərə dözdükcə zülm edirsən,
Bütün dərd-qəmin içindəyəm Ay Allah.

Yaxşıya pis arvad pis kişiyə yaxşı arvad,
Haqqı tapdalayıb nahaqqa yol açırsan.
Bəzən də şirin candan bezirəm,
Mənə də rəhm eylə Ay Allah.

Arzumu istəyimi ürəyimdə qoyma sən,
Səbr kasam dolub inanımı qırma sən.
Özün məni min bəladan qoru sən,
Mənə də rəhm eylə Ay Allah.

Nədir ay Allah bu fani dünya,
Kimi kasıb kimi varlı dünya.
Kimsə kimin kölgəsində yaşayır,
Yaxşı insanlara yoxdur hörmət Ay Allah.

Kiminin övladı dərddir insana,
Kiminin atası-anası dərddir insana.
Kimisi sözbazdır lap pis dərddir insana,
Boğuluram kədər əlindən Ay Allah.

Nəyə inanıb yaşayasan Ay Allah,
Ancaq ümid ilə yaşayasan Ay Allah.
Mən nakam qaldım ana-atadan,
Göz yaşı içindəyəm Ay Allah.

Qarabağım, hanı torpaqlarımız,
Neçə igidim bulanıb al-qanına.
Baltası var saplağı özümüzdən,
Özün qoru Allah Azərbaycanı.

Göz yaşı içindədir analarımız,
Ahın tutsun düşmənlərimizi.
Torpaqlar alınsın gülsün elimiz,
Qurtar mənidə bu dərddən Ay Allah.

## ETİBARSIZ

Həyatımda bir dəfə heyranın oldum,
O şirin sözlərinə ceyranın oldum.
Sən sevdin mən sevməyəcəkdim inan,
Sən məni aldatdın ay etibarsız.

Axı sən and içdin bir gün,
Bir Allah şahiddir bir aylı gecə.
Nə etdim mən sənə ay dili qafil,
Sən məni aldatdın ay etibarsız.

Boylanıb yoluna gözlərim dolur,
Yaşlı gözlərim göynəyir axı.
Sənin qəlbin nə çirkin imiş,
Vəfasız olmağın qaranlıq imiş.

Budur çatıb ayrılıq dəmi,
Gedirsən yolların uğurlu olsun.
Xoşbəxtlik səadət bir də məhəbbət,
De hara gedirsən ay etibarsız.

Qəlbimə qara bulud dolub kədərdən,
Ümid ilə yaşayır ürəyim kədərdən.
Qəlbimə tac qurub sənin məhəbbətin,
Səni özümdən çox sevirdim ay etibarsız.

Adın əzizdir uludur bu dünyada,
Etibar yoxdur hər yetən insana.
Nə tez aldandın özgə yalan məhəbbətə,
Mənim sevgimi tapdadın ay etibarsız.

## ZAMAN DONUB

Qəlbimə qara buludlar dolub kədərdən,
Mənim könlüm olub talan dünyanı alıb yalan.
Kim-kimi aldadar zaman donub dünyada,
İnanmayın hər sözə zaman donub dünyada.

Sevgi yoxdur hörmətdə yoxdur zaman donub,
Sıxılır ürəyim dəyişir halım.
Xəyalım qartaldır səmadan enməz,
Bülbül olub uçaram boylanaram səmadan.

Həyatı vermişəm bada ay cavanlar,
Möhkəm olun sizdə ay cavanlar.
Qoruyun öz ailənizi zaman dönüb dünya,
İnanmayın hər şirin sözə ay cavanlar.

Aldanmayın özgə şirin məhəbbətə,
Ögey məhəbbət acı olar ay cavanlar.
Murdar insanlar şirin dil olar,
Əzəli varsa da sonu aclıq olar.

Ailə həyatda açılan ilk səhərdir,
Qəlblərə tac quran ilk məhəbbətdir.
Zəhmət çəkin bəhrəsin görün,
Hər səhər Allaha dua edin zaman donubdu.

## HƏYAT GƏLDİ GEDƏRDİ

Yaradan qüvvəmiz Allah da olsa,
Həyatın var qüvvəsindən yaranmışıq biz.
Həyat dolu gülüşlü həm də çox ağlamalı,
Kimi bu dərdə dözər kimi də ölər.

Düşünüb-daşındım aciz adam kimi ağladım,
Soraqladım çox adamdan soruşdum.
Xoşbəxtsənmi yada bədbəxt,
Gözlərim doldu dilim tutuldu.

Həzz ala bilmədim bu həyatda dedilər,
Bədbəxtəm deyənlər yüzə doxsan oldu.
Xəyanət qurbanlarıdır yaxşı insanlar,
Bu həyat gəldi-gedərdi ay aman.

Fəryad deyir gözəl insanlar,
Şeytanlardır deyib-gülənlər.
Sözümdə həqiqət var yoxdur yalan,
Məzarım od tutub yansada belə,
Bu həyat gəldi-gedərdi ay aman.

## UNUDA BİLMİRƏM

Sıxılmışam qəfəsdə gözlərəm səni,
Günlər aylara dönüb keçir belecə.
Gecə-gündüz gözlərəm gözlərəm səni,
Xəyalım sorağındadır unuda bilmirəm.

Hər gün yada salıb düşünürəm mən,
Unutmaq istərəm unuda bilmirəm.
Görəsən vicdanı necə dözür buna,
Görsəm üzünü artar zavalım.

Ürəyim sənin əlində oyuncaqmış,
Qırdın ürəyimi düzəlməz daha.
Sevgi həyatdır sevgi ümmandı,
Allahda səni bağışlamaz inan.

Sən məni heç zaman görməyəcəksən,
Uzaqdan baxacam görüm halın necədir.
Mən səni həmişə xatırlayacam,
Sanki görəcəyəm ümmanlarımı.

Səni röyalarda axtaracam inan,
Xəyallarımda yaradacam inan.
Gercəkdə rədd edecəm inan,
Unut desən də unuda bilməyəcəm.

Sən ömür sürürsən başqası ilə,
Mən kiməm nəçiyəm bilməyirsən.
Dünyadan köçəcəm sənin qəlbin ilə,
Unuda bilmirəm unut desən də.

## SƏN SEVMƏSƏNDƏ

Eşqin atəşinə yanıram odsuz,
Yanıram alovsuz sönürəm susuz.
Mən bu sözlərimi deyirəm onsuz,
Səni sevəcəyəm sən sevməsəndə.

Eşqinlə odlansan pərvanələr tək,
Çöllərdə dolansam lap məclunlar tək.
Sözümü deyirəm aşiqlər tək,
Səni sevəcəyəm sən sevməsəndə.

Ürəyim deyir əllərim yazır,
Gözlərim gözləyir yol izlərini.
Sözlərim incədir qırmaram ürəyini,
Yazıram ki, biləsiz onsuzdur ürəyim.

Eşqin bağçasında xəstədir könlüm,
Gəncliyimin bağçası açmadı bir gül.
Ünvanına gələ-gələ ağlayıram,
Sən sevməsən də sevirəm səni.
***28.03.2003***

# İNANMIRAM DAHA

Səni sevirəm deyən oğlan,
Üzümə baxıb and içən oğlan.
Ömrümə ilk baharsan dedin,
Səni atsam daşa dönüm dedin.

Bəs nə oldu indi sənə,
Özgə ilə gəzib gülürsən.
Dediyin sözləri başqasına deyirsən,
Ümid bağlayıb necə deyirsən.

Görəsən məni görəndə necə olacaqsan,
Payız kimi qəlbin soyuqdur mənə.
Necə inanım bundan sonra sənə,
Günəşli günlərim qara yaz olub mənə.

Kaş könül verməyəydim sənə,
Kaş ömür verməyəydim sənə,
Kaş çox sevməyəydim səni özümdən,
Fəryad edib deyirəm sənsən vəfasız.

Buluşacam səninlə gözləmə məni,
Ayrılmışam mən səninlə həmişəlik.
Xahiş etsən də minnət etsən də,
Bağışlanmaz qəlbim inanmıram daha.
***28.03.2003***

# AĞLAMA

Könül sözlərinlə mənə bir söz deyəndə,
Titrək əllərinlə əlimi özünə sıxanda.
Sənə könül verib sevəndə dəyişdi halım,
Qəfil ayrılanda dəyişdi halım.

Sevgini itirəndə ağladı gözlərim,
Dünyanı dəyişənlərə ağladı gözlərim.
Şirin kəlmələr düşür yadıma ağladı gözlər,
Ömrüm-günüm puç olsada ağlama.

Yağışda damcılara baxıb ağlaram,
Həyatda məni sevənə baxıb ağlaram.
Getmə qayıt gülə-gülə ağlaram,
Sənsiz qalan gözüm eşqim ağlaram.

Yerinə yetmədi heç bir muradım ağlaram,
Çox zaman həyatımın acısına ağlaram.
Etibar yoxmuş sevgiyə ağlaram,
Məni nakam qoyub gedənə ağlaram.

Qəfil fələk alsa canımı ağlama,
Göz yaşların ilə məni yuyub ağlama.
Cənazəm qalxanda həyatıma ağlama,
Soyuq məzarımı qazanda ağlama.
***28.03.2003***

## ƏSGƏRLİK HƏYATI

Əsgərlik belədir ay qohum-qardaş,
Mən sizə söyləyim siz qulaq asın.
Uzun gecələri fikirli yatır,
Az qalır partlasın bağrı əsgərin.

Başına döndüyüm ay doğmalarım
Tərsinə döyünür ürəyi əsgərin.
Hər axşam-səhər padyom verəndə
Onda ürəyi çırpınır əsgərin.

Gündə 3 dəfə yedizdirir yarmanı
İşlə deyir verməmiş normanı.
Xoruz banlamamış çalır zurnanı
Haram qatır yuxusuna əsgərin.

Eşqə düşüb sevgi məktubu yazanda
Patrul onu yaxalayıb tutanda.
Əlində dəsmal polu yuyanda
Az qalsın qırılsın beli əsgərin.

Həsrət qalır yağa, bala, qaymağa,
Əl çatmır daim elə-obaya.
Elə ki başlayır kartof soymağa,
Soyuq əli qızmayır əsgərin.

Köhnəlmiş ədyalı salır üstünə,
Yazıq cavanları salır pis günə.
Dinəndə keçirsən kafir əlinə,
Dinməyəndə çıxır canı əsgərin.

Şirin yuxuda padyom verəndə,
Rubaşka əvəzinə şalvar geyəndə.
Elə ki incidi naryad verəndə,
Az qalır ürəyi partlasın əsgərin.

Həftədə bir dəfə hamamı olur,
Birdən 200 nəfər içəri dolur.
İsti su qurtarır soyuq su gəlir,
Bədəni çirkli qalır əsgərin.

İlk dəfə kazarmada yatanda,
Ərşə çıxır ahı-zarı əsgərin.
Axşam olub gün əyilib batanda,
Yada düşür öz vətəni əsgərin.

## AY ETİBARSIZ

Sevirdin indiyədək bəs niyə atdın,
Uydum etibarına ay etibarsız.
Yoxsulu varlıya bəs niyə satdın,
Ürək bir deyilmi ay etibarsız.

Bu dünyada qərib quşam mən,
Düzü dərd çəkməkdən yorulmuşam.
Qəm-qüssə içində keçir həyatım,
Bilmirəm nə üçün yaşayıram mən.

Mən sənə inanıb səni sevmişəm,
Bu təmiz qəlbimi sənə vermişəm.
Yadından çıxmasın bu qısa sözlər,
Sevən öz yarının yolunu gözlər.

Qəlbdə solan məhəbbət birdə barışmaz,
Küsən dərdli qəlb birdə barışmaz.
Nə çoxdur söz verib aldadanlar,
Aldanan qəlblər birdə barışmaz.

Arzu edirəm olmayın vəfasız,
Heç kimin gözü qalmasın yolda.
Eşqdir insanın uca göyləri,
Eşqsiz dünyanın nədir dəyəri.

Səndən üzülsədə əlim dəyişmərəm mən,
Eşqini ömrüm boyu əzizlərəm mən.
Vəfalı könlümə vəfasız olma,
İnanıb yadlara olma vəfasız.

## BAHAR GƏLDİ

Əziz gənclərimiz xoş bahar gəlir,
Özü ilə gül-çiçək gətirir.
Hər yan çal-çağır deyir,
Quşların cəh-cəhi deyir bahar gəldi.

Çəmənliklər göyərib açıb lalə-bənövşə,
Səməni qoyub qızlar qismətin gözlər.
Oğlanlar qurşaq atıb sevib-seçir qızları,
Qismət tale birləşib başlayır toy günləri.

Müqəddəsdir bahar ayı ey insanlar,
Allah həm bitki cücərdir həmdə insan.
Qəlblərə xoş müjdə verir,
Deyir əziz bahar gəldi.

Ağaclar çiçəkləyir könüllər kimi,
Sevəni-sevgisinə qovuşdurar bu bahar.
Sevən öz gülünü dərər deyər bahar gəlir,
Müqqəddəs bir fəsildir deyər bahar gəldi.

***21.03.2003***

## QƏDDAR

Sevirəm deyən bir qəddar,
Əhdi ilqarı birdən pozdu.
Bir başqası ilə tanış oldu,
Öz sevgilisin yaddan çıxartdı.

Onlarla gündə güldün-danışdın,
Qəddar ürəyinlə qırdın qəlbimi.
Səni sevəni torpaq kimi tapdadın,
Öz sevgini niyə ucuz tutdun.

Mən isə gözlərim yolda qulağım səsdə,
Daha qalmayıb məndə həvəs də.
Dəli kimi hər dəqiqə yaddaşımdasan,
Könlüm qəmlə dolub ağlayıram mən.

Zülmət etdin bu dünyanı mənə,
Təzə sevgilinə dəyişdin məni.
Görünür sevgin bura qədər imiş,
Mənə olan sevgin yalan imiş.

Yolumuz ayrıldı bununla bizim,
Sən qəddar idin mənə də öyrətdin.
Bağışla desən də bundan belə,
Qəddar ürəyini bağışlamaz daha.

## SƏNSƏN ÜMİDİM

Həyatımda bir dəfə sevmişəm mən,
Könlüm yarpaq kimi əsdi neyləyim.
Eşqini bildirəndə əsdim neyləyim,
Qəmli baxışlarım ötüşdü neyləyim.

Könlümü açdım gözəl yara,
Həyatda sənsən ümidim deyə.
Məhəbbətdir insana ümid verən,
Günü-gündən insana qüvvət verən.

Naz eylədim sevgili yara,
Dedim gözlə öz qismətini.
Dedi elçi yollayıram,
Sənsən qismətim ümüdüm belə.

## VƏFASIZ QIZ

Məni eşqə salan qız,
Eşqimə cavab verib razılıq etdi.
Sevirəm de məni qoydu intizarda,
Hər dəfə yolundan keçəndə gördüm.

Qəfil bir gün soyuq gördüm,
Məni görəndə kənar keçib getdi.
Məhəbbətimə soyuq cavab verdi,
Bir başqasına nişanlayıblar.

Necə imiş bu dünya necə,
Kimə könül açdım vəfasız oldu.
Məni qoyub yarı yolda,
Bir başqasına gəlin köçdü.

Nələr düşünüb nələr yazım,
Taleyimə yalvarıb deyirəm aman.
Sevənləri ayırma bir-birindən,
Gözəl qızları etmə vəfasız.

Görünür hər fəsili sevəndə var,
Payız soyuq olanda qəlblərdə soyuqdur.
Ayrılıq həsrətdir əzablı payız,
Mənim də qəlbim soyuq olur payızda.

Heyfslənmə gül-çiçəklər solur,
Hər yaz gül çiçək açacaq.
Payız olmasa bərəkət olmaz,
İnsan qəlbidə solar açılar.

Günəş göydə batar ulduzlar yox olar,
Hər yağış yağanda payız sevinər.
Payızam mən sevin mənidə,
Özü bərəkət gətirər soyuq payızda.

## SƏNSİZ

Sənsiz qəzəblənib gəzirəm mən,
Sənsiz yarpaq kimi budaqda əsirəm.
Sənsiz könlüm buza dönüb oyanar,
Sənsiz alovlu ürəyim sönər.

Sənsiz günəş göydə batdı,
Sənsiz ay ulduzlarda çıxmaz.
Sənsiz yağış yağar, hey yağar,
Səni də mənim yadıma salar.

Sənsiz yaralı quşam mən,
Qanadım yoxdur uçam göylərə.
Sənsiz bulud tək dolanıram mən,
Səni yada salıb kədərlənirəm.

Sənsiz nə gecəm var nə gündüzüm,
Sənsiz gəzirəm tək sahil qırağında.
Gəzirdik biz qol-qola sahil qırağında,
Sənsiz gəzirəm indi tək ancaq.

## MƏHƏBBƏTƏ İNANMAYAN QIZ

Deyirəm mələklər mələyisən gülüm,
İnanmır sözümə keçir kənardan.
Deyirəm gözəllər gözəlisən gülüm,
İnanmır sözümə keçir kənardan.

Bəs mən nə edim pərvərdigarə,
Məhəbbətimə inanasan sən.
Sözlərimə soyuq cavab verirsən,
Məni intizarda qoyub gedirsən.

Görünür aldanmısan sevgidə sən,
İndi isə inanmırsan daha heç kimə.
Mənim də sevgimə ümid etmirsən,
İnanmayıb sözümə keçib-gedirsən.

Uşaq kimi sürünürürsən dalınca,
İzlərilə gəlib gedirəm gülüm.
Eşqimə soyuq baxıb gülürsən,
İldırım kimi qəlbimi qırırsan.

Ümidim yoxdur bir daha sənə,
Məni də ürəkdən sevəsən gülüm.
Nədir həyatda günahım mənim,
Eşqimə eşqinlə cavab vermirsən.
***2003***

## QƏLBİM DƏRDLİDİR

Mən həyatda gülüşü az gördüm,
İşıq gələn yolları qaranlıq gördüm.
Mən dözdükcə dərdi çox gördüm,
İlahi nə dərddir qəlbim dərdlidir.

Yaxşılıq eylədim pislik gördüm,
Haqqın qabağında nahaqlıq gördüm.
Bəzən şirin canımı xəstə gördüm,
İlahi nə dərddir qəlbim dərdlidir.

Arzu-diləyimi məhv etmə sən,
Ümidimi, inamımı qırma sən.
Özün məni qoru bəladan sən,
İlahi nə dərddir qəlbim dərdlidir.

Həzz ala bilmədim dünyadan mən,
Yaman ana dağı, qardaş dağı gördüm.
Ata nakamlığı, ata qəddarlığı,
Dağıldı ana yurdum qəlbim dərdlidir.

Hanı o şən gülüşlü ana yurdum,
Hanı ata nazı, o ata səsi.
Necə dözüm bu dərdə, Allah,
Anam da torpaqda yata bilməyir.

Bəzən boğulub gizlin ağlayıram,
Qaçmaq istəyirəm bu dərd-qəmdən.
Əsər-əlamət qalmayıb cavanlığımdan,
İlahi necə dözüm, qəlbim dərdlidir.

Gözlərim gözləyir qardaş-bacımı,
Qərib quş kimi təkəm tək ancaq.
Ürək sözlərimi köçürürəm dəftərə,
Qələmim əsir dözmür bu sözlərə,
İlahi necə dözüm, qəlbim dərdlidir.

## YAY

Hər yer işıqlandı,
Soyuq hava qurtardı.
Ağaclar bol bar verdi,
Dünyada işıqlandı.

Təbiət gözəlləşir,
Açılıbdı çiçəklər.
Yayın xoş gəlişinə,
Sevinirik hamımız.

İsti hava başlandı,
Sevincəkdi uşaqlar.
Çıxır gəzintiyə uşaqlar,
Sevinib əylənib oynayırlar.

İsti hava şən olar,
Nərgiz bənövşə baş qaldırar.
Hər yer şən gülşən olar,
Deyər gülər uşaqlar.

## ANAM

*(Kiçik qızım Şəhla yazıb bu şeiri. Qızımdan yadigardı.)*

Şirin-şirin danışar,
Məni əzizləyir anam.
Mənə kuklada alır,
Mənim anam əziz anam.

Dərslərimə kömək edir,
Bilmədiyimi öyrədir.
Şeir mahnı öyrədir,
Mənim anam əziz anam.

Dən düşdü qara telinə,
Gözəl nazlı anamın.
Ürəyimə dərd oldu
Anamın ağaran teli.

Ürəyim, qəlbimsən ana,
Böyüyüb boya-başa çatdırdın.
Ömrümün yollarına nur çilədin,
Mənim zəhmetkeş anam.
***03.04.2003***

## NƏNƏ

Gözlərin nur kimidir ay nənə,
Mən səni görmədim can nənə.
Lap günəşə bənzərdin ay nənə,
Şirin nənə həsrətəm sənə.

Gözəlliyin alıb qəlbimi,
Kaş görəydim səni nənə.
Gecələr danışaydın nağıl,
Şirin nənə həsrətəm sənə.

Fikirləşirəm bu zaman,
Mənim də nənəm olaydı.
Saçıma tumar çəkib incə əliylə,
Şirin nənə həsrətəm sənə.

Ziyarətinə gələndə gözlərim dolur,
İncə qəlbimə qara ləkə olur.
Var dostlarımın nənəsi,
Lakin yoxdur mənim nənəm.

Acı fələk çəkdi mənə dağ,
Vaxtsız necə qıydı sənə.
Şirin səsinə incə əlinə,
Həsrət qoydu dağ çəkdi mənə.
***23.04.2003***

## DOSTUM GÜLNARƏ XANIMA

Yaşa bu dünyada yaşamaq üçün,
Ürəyində solan eşqi yaşatmaq üçün.
Dostu dostan seç düşmən olmasın,
Ürəyinə odlu yara olmasın.

Kainat sussada taleyim yatsada,
İldırım çaxsada günəş batsa da,
Dəniz yerinə çay axsada,
Mənim dostluğum əbədi olar.

Yalançı dostluğa inanmıram mən,
Ləkə yaraşmır təmiz vicdana.
Arzu edirəm sənə təmiz duyğular
Allah verən xoşbəxtliyi yaşayasan.

Gəl at ürəyindən solan çiçəkləri,
Yaşa dünyanın xoş gələcəyin.
Demə bu dünya vəfasızdır sənə,
İsti ürəyinə isti yuva sal.

Yaraşar sənə gəlinlik tacı,
Dostların səninlə edəcək fəxr,
Arzuna, istəyinə çatasan,
Allah verən ömrü yaşa, Gülnarə.
***05.08.2003***

## DOĞMA ELLƏRDƏN KEÇDİM

Torpağı xəzəl döşəməli,
Alimlər aqillər eli.
Açılmamış novruzgülü,
Lənkərana düşdü yolum.

Çaylar gördüm burda danışır,
Vətənidir bura eşqi.
Bu ətrafa bax ay sürücü,
Gülüstandır sağın-solun.

Cəlilabad, Masallımız,
Süfrəsi yağlı-balımız.
Övladları kamallı,
Lənkərana düşdü yolum.

Dediyim sözlərə qulaq as sürücü,
Bir insafa gəl dayan sürücü.
Gördüyün yollar ilə tanış ol,
Dolan gəz qoynunda Lənkəranın.

Sənin pərəstişkarınam Lənkəran,
Min dərdin dərmanı, Lənkəran.
Dolansın boynuma qolların,
Hər evində mehman oldum Lənkəran.
***07.08.2003***

## MƏNƏ MANE OLMA

Səni sevdiyim günə lənət olaydı,
Kaş o günə qara daşlar yağaydı.
Məni niyə sevib, niyə atdın,
Bu gündən mənə mane olma.

Əlində tutmusan neçə qəlbi,
Mənim qəlbimi nə olar dağlama.
Bir dəfəlik de ki, sevmirəm səni,
Bu gündən həyatıma mane olma.

Ürəyimi parça-parça etdin,
Verdiyin lalə gülləri mənə dərd etdin.
Baxa bilmirəm daha o güllərə,
Sevginə yadigardı o güllər.

Mən sənə nə deyim başa düşəsən,
Öz sevgin daşlar arasına düşməsin.
İnanmıram mən daha şirin sözə,
Bu gündən mənə mane olma.

Ölsən torpaqlara qoymaram səni,
Yerin ürəyimin lap başındadı.
Yuyaram səni göz yaşlarımla,
Ürəyim buz kimi soyuyub gedər.

Ayrılıq dözümündə ağlar gözüm,
Şirin olmasaydı sevgin bu qədər.
Olan kimi həyatımı zəhərləyib atdın,
Bu gündən mənə mane olma.

Sənsiz olan günlərim solğun çiçəkdir,
Sənsiz olan günlərim danışıb-dinməz.
İnanıb yad məhəbbətə unutdun məni,
Bu gündən mənə mane olma.
***15.08.2003***

## AĞ ATLI OĞLAN

Atların içində seçilir atın,
Sanki yarışa giribdir atın.
Özün bir yaraşıqsan bu ata,
Başını uca tut ağ atlı oğlan.

Neçə-neçə atların içində görsəm,
Mənim öz xəyalımda yaşayan sənsən.
Gün-gündən xəyallarda ucalasan,
Başını uca tut ağ atlı oğlan.

Bütün musiqilər sənə yaraşır,
Göydəki ulduzlartək sayrışır.
Günümü etmə qara ağ atlı oğlan,
Dərdimin dərmanı ağ atlı oğlan.

Gözüm axtarır atlar içində,
Sənsiz həyat sönükdür mənə inan.
Günümü etsən də qara ağ atlı oğlan,
Mənim qəlbimsən ağ atlı oğlan.
***16.08.2003***

## YALVARACAQSAN

Həyatda sevdiyim gün sevinmişdim,
Qönçə güllər mənə qol-qanad vermişdi.
Sənin acı dillərini görəndən bəri,
Öz məhəbbətimi silib atdım.

Desələr o həkimdir səni sağaldar,
Desələr o dərmandır dərdin sağalar.
Öz inamını qırdın çoxdan sən,
Bir daha gəlib yalvarma sən.

Sən mənim qəlbimə qılınc çaldın,
Sən mənim ürəyimin yarasın qopartdın.
Görəsən öz hərəkətindən utanırsan,
Acı-acı kəlmələrə dözə bilmirəm.

Haçansa üzünü tutub mənə sarı,
Gedim üzr istəyim mən ona sarı.
Qırılan ürəyim barışmaz daha,
Sən mənə bir daha yalvarma.

Şirin dilinə inanmıram mən,
Başqasın sevəndən məni xatırlama.
Soldu qəlbimin açan çiçəkləri,
Bir daha gəlib yalvarma.

Şəlalələr axır şırım-şırım,
Həyatımı etdin qırıq-qırıq.
Yay bitər gələr soyuq qış,
Bir daha gəlib yalvarma.

Yalvaracaqsan haçansa mənə,
Allah da bağışlamayacaq səni.
Sənin dilin yalan, hərəkətin yalan,
Yalvarma bağışlamayacağam.

İllər ötəcək qocalacaqsan,
Cavanlıq illərin xatırlayacaqsan.
Onda üz tutub yalvaracaqsan,
Heç zaman mən səni bağışlamayacam.
***17.08.2003***

## GÜNAHIM NƏ İDİ

Dünyaya gəldim bədbəxt,
Bütün bəlaları gördüm.
Ümidlərim qırıq-qırıq,
Mənim nə idi günahım.

Allaha dua edib yalvarıram,
Pis bəladan uzaq olum.
Taleyim belə yazılıb,
Mənim üçün yaranıb əzablar.

Mən nə günah etdim,
Allah, Allah deyib yalvarıram.
Sevgim ötən sevgidir,
Məni ondan ayırma deyir.

Həyat qısadır ay Allah,
Duyğularım sənə qalıb Allah.
Bəladan uzaq et məni Allah,
Günahım nə idi ay Allah.

Hər addımda günahkar oldum,
Bir canım var sənə qurban.
Bir gün yaranan bir gün gedər,
Sonunda ondan ayırma məni.
***18.08.2003***

# İNCİTMƏ MƏNİ

Həyatım sənə bağlıdır,
Ayım günüm sənə bağlıdır.
Ömür dəqiqələrim sənə bağlıdır,
Nə olar gəl incitmə məni.

Gəl nə olar mənə sevirəm de,
Ayım, günüm səninlədir inan.
Gəl mənə həyatım de sevgimə inan,
Sevgilim bu qədər incitmə məni.

Əvvəllki günlərə qayıt deyirəm,
İstərəm səni bağrıma basım.
Gəl məni qəhərdə boğma deyirəm,
Nə olar gəl incitmə məni.

Qəlbim incədir gəl inan mənə,
Ürəyim üzülübdür gəl inan mənə.
Çəkə bilmirəm bu qəmi mən,
Nə olar gəl incitmə məni.

Gözləyirəm hər an yolunu,
Əlimdə qalıb əlinin izi.
İsti nəfəsini qalan izini,
Dərin məhəbbətini duymaq istərəm.

Güclü olsamda səndən əbədi,
Öz qəlbimdə qalacaqsan əbədi.
Eşitsən ölürəm gəlmə əbədi,
Cənazəm altına girmə əbədi.

Hər qaranlıq gecəm çətindir mənim,
Hər gecəm göz yaşıdır mənim.
Ümidlə xəyalla yaşayıram mən,
Nə olar gəl incitmə məni.

Ağırdır mənə yol gözləmək,
Soruşuram səni hər gəlib-gedəndən.
Yay ötsədə payız gəlsədə,
Sənin məhəbbətin yandırır məni.

Əhd-peymanın sənə qənim olsun,
Şahid ulduzlar sənə qənim olsun.
Gəlməsən ölüncə gəlmə ay vəfasız,
Qırılan qəlbimi incitmə mənim.

## XƏYALIMDA QALACAQSAN

Sözlərin mənim xəyalımda qalacaq,
Adım sənin xəyalında qalacaq.
Röyamda görəcəyəm hər an səni,
Mən səni unuda bilməyəcəyəm.

Bir vaxt sevdiyini duyacaqsan,
Artıq hər vədin gec olacaq.
Eşqin məhəbbətin solğun olacaq,
Sən məni unuda bilməyəcəksən.

Çıx get bu şəhərdən,
Bəlkə unutdun məni.
Sınan qəlbim düzəlməz daha,
Mən səni sevə bilmirəm daha.

Mən özümə söz vermişəm,
Bir daha tanımıram səni.
Sevmişdim səni unudacağam səni,
Lakin xəyalımda qalacaqsan əbədi.

## SARIŞIN OĞLAN

Dostluğun məhəbbətə çevrilib,
Öz iradəni saxlaya bilmədin.
Qızı yoxlamaq bəhanəsi ilə,
Heç bir fırıldağın baş tutmadı.

Yetim kimi boynun bükmə ay oğlan,
Qız səni sevmir sarışın oğlan.
Sevgilin sevginə cavab vermir,
Heç utanırsanmı öz hərəkətindən.

Qızı görəndə özünü itirirsən,
Anasını görəndə dil-dil ötürsən.
İçin özünü yandırır çölün özgəni,
Sevirəm sözünü deyə bilmirsən.

Elçi yollamağa gəlmir ürəyin,
Qorxursan ailə qurmağa ay oğlan.
Qız sənə deyir uşaqsan hələ,
Fikirləş sənə nə deyir ay oglan.

Öz sevgilindən gah küsüb barışırsan,
Etdiyin hərəkətləri heç fikirləşirsən.
Özünü öyüb dağar eyləmə sarışın oğlan,
Qız anasına cavab qaytarma ay oğlan.

Hər sözdən inciyib dayanma,
Sözü-söhbəti böyütmə sarışın oğlan.
Sevən oğlanın elçisi olar,
Məhəbbət tin-bucaq deyil sarışın oğlan.

Aylarla qızı görmürsən ay oğlan,
De görüm necədir halın.
Qıza deyirsən ay tərbiyyəsiz,
Sevginin içində var acı dilin.

Əyil qız anasına sarışın oğlan,
Bəlkə sevgilinə qovuşdun inan.
Dağarlığını unut deyirəm,
Bəlkə sevgilinə qovuşdun sarışın oğlan.

## BİR DAHA SEVMƏYƏCƏYƏM

Həsrətlə yollarında qoyma gözümü,
Bir daha səni sevməyəcəyəm.
Ümidlə günləri daha saymayacağam,
Gözüm qapıda qalmayacaq inan.

Gəlib-gəlməməyin maraqlanmıram,
Özünü gəlib istədmə mənə.
Hər tində başqasın sevib,
Mənə eşqini bildirmə daha.

Mən səni bir daha sevməyəcəyəm,
Silib ürəyimdən qoparıb atdın.
Ürəyimi təmiz istəyirəm mən,
Mən səni bir daha sevməyəcəyəm.

## İNSAFSIZ

Yuxum gözlərimdən çəkilib belə,
Sən məndən küsəndən belə.
Qəlbim qırılıb ay insafsız,
Gözümün yaşı qurumur ay insafsız.

Nə olar gəlmirsən-gəlmə,
Heç olmasa zəng elə.
Küsəndə mən küsmürəm,
Məni yad eylə ay insafsız.

Yollarına baxa-baxa qaldım,
Günləri saya-saya qaldım.
Sevmişdin məni ay insafsız,
Gəl qəlbimi qırma ay insafsız.

Hər axşam qəlbim sıxılır,
Ürəyim darıxır ay insafsız.
Məhəbbətini belə soyuq bilməzdim,
Həyatda kinli olma ay insafsız.

## GƏL SEVGİLİM

Getmə mənim sevgilim,
Ürəyim sıxılır getmə gəl.
Mən sənə nə etdim bilmirəm,
Qollarımın arasından getmə gəl.

Fikrim zikrim səninlədir,
Ürəyim damarlarım səninlədir.
Gecəm gündüzüm səninlədir,
Darıxıram məni öldürmə gəl.

Musiqi içində axtarıram səni,
Buludlar içində axtarıram səni.
Gecələr ulduzlar içində axtarıram səni,
Darıxıram gəl, gəl sevgilim.

Gəl barışaq qoşa gəzək,
Bizi tanıyanlar görsün qoşa.
Yaraşmır bizə ayrılıq,
Ümüdimi qırma gəl sevgilim.

Sənlə nəfəs alıb yaşayıram,
Yoxluğuna tab gətirmirəm bir daha.
Sən atsan da məni sevirəm səni,
Ümidlə yolunu gözləyirəm sənin.
***07.10.2003***

## NƏDİR GÜNAHIM

Ömrümə nur ilə alış yan eşqinə,
Ruhumda qanımda sənindir dedim.
Solan çiçəklərim açılacaq dedim,
Ya Rəbbim nədir günahım.

Mən öz könlümdə doğulan eşqimi,
Dərin məhəbbətimi verdim könülsüzə.
Ya Rəbbim başıma gələnlər nədir,
Sınaqdır bilmirəm nədir günahım.

Ürəyim dözmür bu ayrılığa,
İncə qəlbim yaradır Allah.
Yaşlı gözlərim qalıb yollarda,
Ürəyim parası gəlmir bir daha.

Səndən kömək istəyirəm ya Rəbbim,
Arzumu niyyətimi puç etmə sən.
Məni öz sevgilimə qovuşdur sən,
Ya Rəbbim nədir günahım.

## ANA

Gəldim dünyaya bir gün ay ana,
Yuxularına haram qatdım ay ana.
Yuxusuz gecələrinə qurbanam ana
Gəl səni bağrıma basım ay ana.

Sən mənə çox əzab-əziyyət çəkdin,
Naz-nemət ilə böyütdün ana.
Mən sənə sığınmışdım ay ana,
Məni niyə atıb getdin ay ana.

Mənim sənə əlim çatmır ana,
Hardan tapım səni bilməm ana.
Ürəyim doludur dərd qəm ilə ana,
Gəl səni bağrıma basım ay ana.

İstəyirəm soyuq baş daşını,
İstəmirəm daş üzərinə soyuq simanı.
Qalx ayağa isti nəfəsini istəyirəm,
İstərəm səni bağrıma basım, ay ana.

Sənin fəlakətli ölümün yandırır məni,
Hər gün yuxumda görürəm səni, ay ana.
Bilirəm məndən ötəri narahatsan,
Gəl səni bağrıma basım, ay ana.

## XƏSTƏYƏM MƏN

Dağlar əbədidir bu dünyada,
Sular axıb dövr edir bu dünyada.
Mənim qəlbim dərdlidir xəstəyəm mən,
Bu dünyaya vəfa qılmadım mən.

Cavan ikən sağlam can arzuladım,
Əksinə bir dərddən qurtarıb.
O biri dərdə düşdüm mən,
Bu dünyaya vəfa qılmadım mən.

Cərrahiyyə stoluna dönə-dönə düşdüm,
Söküldü bağrımın başı xəstəyəm mən.
Cavan ölümdən belə qorxmuram daha,
Bu dünya mənə vəfa qılmadı.

Həyatın enişli-yoxuşluğundan,
Həyatın sıxıntılığından qorxmuram.
Övladlarımın qəmginliyindən qorxuram,
Ömür ver mənə Allah üç qız anasıyam.

Sənsən mənim qolum-qanadım,
Ümid yerim sənsən Allah.
Dərd-bəladı düşmüşəm xəstəyəm mən,
Bu dünya mənə vəfa qılmadı.

Üzüm gülmədi ürəyim açılmadı,
Bu dünyanı yaşarım xəstəlik ilə.
Cavan ikən köçdüm dünyadan,
Bu dünya mənə vəfa qılmadı.

Evladlarım sənə əmanətdir Allah,
Cərrahiyyədən qayıtsam salamat.
Nəzr-niyaz paylasın məni sevənlər,
Mən də sənə əmanətəm Allah.

## TALESİZ QIZ

Biri var idi biri yox idi,
Bir təmiz qəlbli talesiz qız var idi.
Bu qızın hava kimi qəlbi bəyaz idi,
Hamıya inanıb həyata ümidli idi.

Bir gün qarayanız bir oğlan,
Onun təmiz qəlbinə yol tapdı bir an.
Qız sevindi bu an məndə sevirəm,
Gündən-günə onu hamıdan əziz bildi.

Bir gün bu oğlan qeyb oldu bir an,
Talesiz qızın gözləri qaldı yolda.
Günlər keçdi gəlmədi bu oğlan,
Qızın səbr kasası doldu bu an.

Telefonu götürüb ona zəng vurdu,
Qulağına inanmadı bu an.
Bir də mənə zəng etmə dedi,
Nə acı taledir mənə yazılıb.

Oğlanın acı kəlmələrinə inanmadım,
Bir də zəng vurdu cavab gəlmədi daha.
Qızın pullarından istifadə etdi,
Sevgini pulla ölçdü bu oğlan.

Bəyaz qəlbli qız qara taleyəm dedi,
Gülər gözləri gülmədi bir daha.
Bulud kimi doldu gözləri,
Gecə-gündüz ağladı bu qız.

Gəlməyirsən gəlmə ay vəfasız,
Mənə ləkə atma ay etibarsız.
Gəlsəndə qəbul etmirəm bir daha,
Mənə yoldaşdır Quran bir də Allah inan.

## HEYF

Səni tanımağım gec oldu heyf,
Saxta sevginə inadım heyf.
Təmiz vicdanımı ləkələdin sən,
Yalan məhəbbətinə inandım heyf.

Məni üzdü bu ayrılıq heyf,
Yalandan üzülüb doğrunu yaşadım.
Bu dünyanın etibarın görmədim,
Dərin məhəbbətin yalan imiş heyf.

Öz sevgini nə ucuz tutdun,
Eşqinə səadətinə düşmən oldum.
Yanıb kül oldum sənin dərdindən,
Səni sevməyim gec oldu heyf.

İnandım əlində tutduğun o gülə,
Boynu bükük incə Lalə gülünə.
Ləkə vurdun o lalə gülünə heyf,
Sevgin etibarlı deyildi heyf.

Lalə gülü inanmır yalan sevgiyə,
Qırmayın incədir Lalə gülü deyir.
Yalan sevgiyə inamıram heyf,
Məni günaha batırmayın heyf.

## BU DÜNYANIN DADI NƏDİR

Məndən təzə şeir istəyin,
Qəlbləri yazım şeir düzümünə.
Həyat doludur qəmlə inanın,
Bilin ki Minayə sizə nə deyir.

Övlad şirin vüsaldır anaya,
Ərin vəfası çoxdur arvada.
Həyatın şirinliyin duyun siz,
Minayə görüb bunların hamısın.

Şeirin böyük meydanı var qəlbimdə,
Xarı-xara düzərəm sırası ilə mən.
Gözüm qalar dünyanın şirinliyində,
Şirin həyatın dadın duyam.

Nəyi deyim nəyi yazım,
Bu dünyanın vəfası yoxdur.
Var-dövlət əl çirkidir inan,
Ana şirinliyindən olmayın nakam.

Yolunuzu azmayın varınız olanda,
Bir birinizin bilin qədrini.
Sonu soyuq məzarıstandır,
Bu dünyanın vəfası yoxdur.

Günah qazanmadım bu dünyada,
Yaralı qəlblərə dərman oldum.
Hər addımında şirinlik duydum,
Bu dünyanın dadı etibarlıqdır.

Nələr gördüm bu qoca dünyada,
Vəzifədə olanlar görmür ayağın altın.
Müdir cib soyur tacirlər kimi,
Kasıbdır torpaqla əlləşib-vuruşan.

Həyatda bəstəkar ol ya şair ol,
Pinəçi ol dərzi ol ya fəhlə ol.
Çalış ki dünyada insan ol,
Bu dünyanın dadı nədir.
Tarixdə silinməz bir insan olun,
Bu dünyanın dadı etibarlıqdır.

## ÖLÜM YARAŞMIR
## SƏNƏ HEYDƏR BABA

Mən xəstə idim bu xəbəri alanda,
Sanki bir anlıq dünya uçdu başıma.
Dəyişdi halım göynədi ürəyim,
Yaraşmır bu ölüm sənə Heydər baba.

Sənin cizgilərin sızlatdı məni,
Sənin surətin darıxmayın dedi.
Oxuya bilməsədə bunu heç kəs,
Sən elin vətənin atasıydın.

Nigaransan sən bu el üçün,
Nigaransan bu xalq üçün.
Nainsaf fələk necə qıydı sənə,
Vətənə gərəkli ataydın sən.

Qəlbin ruhun rahat olsun,
Yerində var igid oğlun.
Yaşadacaq bu oğlun sənin adını,
Yaşadacaq doğma vətəni bu oğul.

İşğal altında qalan torpaqlarımızı,
Qismət olacaq alacaq geri.
Sənində ruhun şad olacaq,
Çəkdiyin zəhmət itməyəcək Heydər baba.

Qərənfillər ilə bəzədilər cənazəni,
Elin ağladı sənin üçün.
Meydan ağladı xalq ağladı,
Həlak olub Heydər baba.

Sınıb qolumuz sınıb qanadımız,
Elin dirəyi köçür dünyadan.
Analar bacılar körpələr ağlayır,
Yaraşmır deyirlər ölüm sənə Heydər baba.

## SƏN UNUDULMAZ DAHİSƏN

Heydərin qəlbi əbədi bir məkandı,
Sonsuz bir dərin məhəbbəti Azərbaycandır
Vətən yolunda əridin son nəfəsinə kimi,
Sən unudulmaz bir dahisən Heydər.

Sənsən xalqın əziz lideri,
Sənsən misilsiz böyük qəhrəman.
Sənsən yanar bir məşəl Azərbaycanda,
Sən ölməzsən dahisən qəlbimizdə.

Unudulmaz bir dağ oldun o gün bizə,
Tarixlər yadigarı şirin ümmansan.
Böyük bir əfsanələr yaşadın Heydər,
Sən ölməzsən dahisən qəlbimizdə.

Yaşayacaqsan yaddaşlarda sən,
Silinməz bir dahisən Azərbaycana.
Sənsən bu dünyaya əvəzedilməz insan,
Zəmanəmizin siyasətçisi Heydər baba.

Xalqın sevir səni dahi insansan,
Son mənzilin yandırır bütün xalqı,
Ağlayır bütün elin sənin üçün,
Dərin bir xatirə oldun xalqın üçün.

Qəm içindədir doğma vətənin,
İtiribdi böyük müdrik atasın.
Son nəfəsinə kimi durdun Vətən keşiyində,
Sən unudulmaz dahisən Heydər baba.

Sənin atdığın hər bir addım,
Dünya ictimaiyyətində ucaltdı başın,
Sənin izlərinlə ucaldı Azərbaycan,
Bizim əvəzsiz şəxsiyyətimiz Heydər baba.

Tarix durduqca yaşayacaqsan,
Silinməz bir dahisən Azərbaycana.
Sən ölməmisən yaşayırsan qəlbimizdə,
Ölməz dahi bir insansan Heydər baba.
***15.12.2003***

## BİRLƏŞƏK AZƏRBAYCANDA

Ey xalqım, doğma vətənim qalxın ayağa,
Qoymayaq millətin qəlbi dağlana.
Gəlin verək əl-ələ düşməni məhv edək,
Yapışaq silahlara birləşək Azərbaycanda.

Düşmən dırnağı batmasın bizə,
Gəlin dayaq olaq İlham qardaşımıza.
İlham itirsə də atasın qoruyacaq elimizi,
Yatmayıb gecə-gündüz yaşadacaq Azərbaycanı.

Birləşək biz bir yumruq kimi,
Açılmasın barmaqlarımız.
Başımız İlham qardaşımız,
Ayağımız torpaqlarımız.

Canımızı qurban verək el yolunda,
Alaq geri düşməndən torpaqlarımızı.
Şəhid olaq doğma vətən yolunda,
Birləşək Azərbaycanda azad yaşamaq üçün.

Qoymayaq bir daha millətin ürəyi dağlana,
Qüvvət gəlsin qollarımıza məhv edək düşməni.
İndi daha keçməz yalan açılar asiman,
Yaşa Azərbaycan birləş Azərbaycan.

## DAHİ İNSAN

Eldən-elə gəzir adın sanın,
Şan-şöhrətin var el yolunda.
Ucalırsan bu dünyada sən,
Dahi bir insansan Heydər baba.

Azadlıq verdin Azərbaycana,
Müstəqillik qazandıq bu dünyada.
Şan-şöhrətsən Azərbaycana,
Dahi bir insansan Heydər baba.

Elə bir yerdə qoyulsun abidən,
Ordan görünsün bütün Azərbaycan.
Xalqın hiss etməsin yoxsulluğun,
Dahi bir insansan Heydər baba.

Yerində var igid İlham,
Vətən deyib dirəkdir Azərbaycana.
Qonar çiyninə mələklərimiz,
Durar keşiyimizdə İlham qardaşımız.

Azərbaycan inanır sənin dahiliyinə,
Fəxr edirik dünyada sənin adınla.
İstəməz dünyada cah-cəlalı sənsiz,
Dahi bir insansan Heydər baba.

## MƏN ÖLÜNCƏ GƏLMƏ

Gəldiyin izlərə baxa-baxa qaldım,
Gözlərim bulud kimi axa-axa qaldı.
Qəlbim dəniz kimi çırpına-çırpına qaldı,
Gəlməyirsənsə mən ölüncə gəlmə.

Əhdinə vəfasızsan bilki indi sən,
Mən son nəfəsimə qədər vəfalıyam inan.
Ağ kəfənə bükülsədə bu canım,
Gəlməyirsənsə mən ölüncə gəlmə.

Eşitsən köçmüşəm bu dünyadan,
El-oba mənim üçün gəlib ağlasa.
Məni son mənzilə yola salmağa gəlmə,
Gəlməyirsənsə mən ölüncə gəlmə.

## YORULMUŞAM MƏN

Arzular sonsuzdur ömür isə qısa,
Mənim də xoş arzum xoş diləyim var.
Sevmişdim ki məndə sevilən,
Yay payız qışıda yola saldım gəlmədin.

Səbrim tükənibdir yorulmuşam mən,
Dərd çəkib gözləməkdən yorulmuşam mən.
Ürəyim yenə dolub qara bulud tək,
Ürəyin daş imiş yorulmuşam mən.

Çox acı dünyada yaşayıram mən,
Fikirdir qəmdir ancaq bu dünya.
Etibar yoxdur heç bir insana,
Fikirdən həsrətdən yorulmuşam mən.

Məhəbbətdə mənə acı dərman oldu,
İçməsəm olmur içirəm yandırır.
Mənim xoş günüm göz yaşı olur,
Dərd-sər içində yorulmuşam mən.

Sən yerə vurdun mənim məhəbbətimi,
Düşünmədin məni bir insan kimi.
Nə tez aldandın yalan məhəbbətə,
Fikirdən həsrətdən yorulmuşam mən.

## QƏLBIM YALNIZ SƏNİ İSTƏYİR

Aylar illər sıxır məni,
Bu ayrılıq üzür məni.
Gecəm-gündüzüm sıxır məni,
Qüssə-kədər üzür məni.

Od çəkdin sinəmə dağlıyam,
Gözüm yolda qaldı qulağım səsdə.
Qəfil gəlişini gözləyirəm mən,
Qəlbim yalnız səni istəyir.

Bir Allaha yaxın billəm özümü,
Ancaq Allaha yalvarıb səni istəyirəm.
Ürəyim göynəyir gözüm yoldadır,
Qəlbim yalnız səni istəyir.

Ulduzlar içində parlaqsan sən,
Əhdi-peymanı bağlamısan sən.
Sən istədin bu ayrılığı,
Qəlbim yalnız səni istəyir.

Bu qüssəyə mən dözə bilmirəm,
Qəlbimə od yaxdın qəlbimi közlədin.
Allaha yalvarıb səni istədim,
Aman Allah onu mənə qaytar.

## DÜNYA

Ey xani-xaniman dünya,
Misli məskanı boş dünya.
Ürəyi qüssəli-qəmli dünya,
Misli məmləkəti boş dünya.

Neçə qüssəyyə dözməyən dünya,
Neçə igid şəhidi olan dünya.
Dözüm istəyirəm Tanrıdan mən,
Qəmdir-qüssədir bu boş dünya.

Sirli-sirdaşı qəmli dünya,
Xoşbəxt insanı olmayan dünya.
Xaini düşməni olan dünya,
Dostu düşməni tanımayan dünya.

Yaxşıya pis, pisə yaxşı verən dünya,
Haqqı nahaq nahaqqı haqq edən dünya.
Mənim könlümü talan edən dünya,
Ey xaini düşməni olan dünya.

Torpağımız tapdaq olub tora düşən dünya,
Xəyanət qubanı talan olan dünya.
Vətəni öz xainindən düşmənli olan dünya,
Milli məmləkəti qəmli dünya.

## SƏN XOŞBƏXTSƏN EY XALQIM

Xoşbəxt bir vətəndə yaşayırıq biz,
Bizi alıb qoynuna bəslədinsən Vətən.
Qüvvət gəlsin qollarına yatışaq bizdə,
Qoruyaq bizdə səni düşməni qıra-qıra.

Qoruyur Vətənimizi indi bir İlham,
Köçəri düşsədə xalqı qorudu bu Vətəni.
Azərbaycan yetişdirir igid qəhrəmanları,
Koroğlunu, Nəbini, Babəki, Cavanşiri.

Sən xoşbəxtsən ey xalqım,
Qoruyur səni İlham kimi igidlər.
İlham Əliyev verir bizə müstəqillik,
Ulu Tanrı verir bizim xoş taleyimizi.

Yaşa Azərbaycan sən azad yaşa,
Qeyrətli övladlar ver bu vətənə.
Azad yaşayan xalqım sıxılmasın qəfəsdə,
Qoruyaq bizdə səni düşməni məhv edərək.

Düşmən əlində qalıb bizim vətən,
İlham arxanı vermə gülləyə.
Sənsən Vətənə igid bir qardaş,
Bizdə sənə olacağıq həm arxa həm dirək,
Xoşbəxtsən ey xalqım qoruyur səni İlham.

## MƏKTƏB İLLƏRİM

Şirin bir vüsaldır məktəb illərim,
Doğma bir evimdir sinif otaqlarım.
Müəllim bir anadır mənim həyatımda,
Müqəddəs bir andımdır məktəb illərim.

Son zəng deyir qəbul et gəncliyini,
Müəllim etibarın itirmə sən.
Ayrılq olsada doğma məktəbimə,
Məktəb adını uca tutdun səndə.

Keçən illərim geri dönsə əgər,
Müəllim etibarın əzizlərəm məndə.
Çalışqan şagird olardım məndə,
Müəllim adını qoruyardım məndə.

Bağışla deyirəm müəllimlərimə,
Şıltaqlıq edib dəysəmdə xətirlərinə.
Uşaqlıq etsəmdə bilməmişəm mən,
Uca tuturam qəlbimdə müəllim adını.

Qayıt deyirəm keçən illərimə,
Tələbə olmaq istəyirəm məndə.
Müəllim şirinliyin qoruyardım məndə,
Ən əziz çalışqan şagird olardım məndə.

Qoy sizi qorusun bir Allahda,
Həyata qədəm qoydurur sizin qələminiz.
Neçə igid verirsiniz Azərbaycana,
İlk ümidləriniz yaşasın deyə.

## QIRDIN QƏLBİMİ

Qəfil başqası ilə görsəndə məni,
Ürəydən yanıb-yaxılma indi sən.
Mənim ürəyim birdir inan sən,
Ürəyim təmizdir sənsən ancaq.

Qəmli baxışın yandırdı məni,
Dözə bilmirəm mən bu ayrılığa.
Mən deyiləm əhdə vəfasız,
Sən göstərdin bu yolu mənə.

Qayıtma deyirəm sənə bir daha,
Sənin sevgin mənə qarşı saxtadır.
Qırdın qəlbimi inanmıram sənə,
İncə qəlbim səni bağışlamaz bir daha.

Niyyətim təmiz qalacaq and içmişəm,
Məhəbbət satılmır qızıla-pula.
Ucuz tutdun saf məhəbbətimi,
Nankorluq yaraşmır mənim qəlbimə.

Səni hər görəndə qəlbim göynəyir,
Görünmə mənim yaşlı gözlərimə.
Gecə-gündüz göz dağısan mənə,
Görünmə bir daha mənim gözümə.

## SƏNƏ ETİBAR EDİRƏM

Sənə etibar edirəm ürək sözümü,
Sənə etibar edirəm, qara gözümü.
Sənə etibar edirəm, yanan ürəyimi,
Məhv edib çırpma qayalara sən.

Sən mənə əzizsən bir ürək kimi,
Sevmişəm unuda bilmirəm inan.
Gözləyirəm hər an yolunu, dönərsən geri,
Sönən çıraqları yandırarsan o an.

Etıbar etmişəm qəlbimi sənə,
Yerə salıb sındırma, salma əlindən.
Gəl geri dön, tutaq əl-ələ,
Sönən məhəbbətimizi bir də yandıraq.
***25.06.2005***

## MÜNDƏRİCAT

